.müxalif təfəkkürlər müqabilində daha da aşkar etdi

Şiə təfəkkürünün İmamət məsələsində qələbəsinin səbəblərindən biri də insanların Bəni Üməyyənin hakimiyyəti dövründə Peyğəmbərin canişini deyib onun yerində oturan hakimlərin əməl və rəftarlarında İslam əhkamına və Üsuluna uyğun heç bir şey .görməməkləri oldu

Bu iş hətta cəmiyyətin onlara qarşı qiyamına səbəb oldu. Baxmayaraq ki, bu qiyamların əksəriyyəti gücün vasitəsi ilə məğlubiyyətə düçar oldu və zahirdə Bəni Üməyyə hökuməti davam etdi, amma bu hadisələr şiə təfəkkürünün insanların .qəlblərində yayılmasına və möhkəmlənməsinə səbəb oldu

:DÖRDÜNCÜ SUAL

Təşəyyuh məzhəbi İmam Sadiq (ə)– dan öncə də dini liderlərin əmrlərində əsas ?müzakirə obiyekti olmuşdurmu

:CAVAB

Əvvəldə söylədiyimiz kimi şiə təfəkkürü Peyğəmbər (s) tərəfindən yaradılmış əsl İslam təfəkkürüdür. Bu məna və mətləbi Əmirəl Möminin Əli (ə)– ın kəlamlarından və Nəhcül .Bəlağədən istifadə edərək başa düşmək mümkündür

İmam Baqir və İmam sadiq (ə) bu təfəkkürü müxtəlif sahələrdə insanlar üçün şərh edərək, insanların bu barədə məlumatlarını kamilləşdirdilər və bu məsələlərdə İfrat və .təfritləri həll etdilər

Onlar İmamətin əsl və tam islamı olduğunu isbat etdilər ki, həqiqəti və onun dərəcələrinin söyləyənlərin Məsum İmamlar olduğunu bildirdilər. Məlum olduğu kimi onlar bütün İslam məfhum və terminlərinin və Quran ayələrinin izah və təfsir edənləridir. Misili olmayan və böyük vəziyyətlərdə onların elmi məlum olur, hamı o böyük şəxsiyyətlərin əsl İmamət məfhumunun kamil və əsas şəkildə tanınmasına cavabdehlik səlahiyyətlərinə və eyni halda yeganə etimadlı mənbə olduğlarını başa düşdülər. Bu o mənada deyil ki, İmamətin

əsasını onlar yeni kəşf etmişlər və ya qeyb aləminə imanları olmayan insanların .sözlərinə əsasən, tarixin müxtəlif hadisələrinin nəticəsi olaraq yaranmışdır

Həmçinin əhl sünnətın mötəbər rəvayətlərindən olan, Əli Binəl Hüseyn (ə), İmam Baqir və İmam Cəfər Sadiq (ə) haqqında rəvayətə əsasən, "Əhməd Şakir" "Əl Baisul Həsis" kitabının şərhində belə yazır: "Bu axırıncı İmamdan öncəki İmamların mənəvi ".mövqiyyəti və İmamətləri insanların qəlblərində çox möhkəm idi

İmamların Quran natiqi olmalarına etiqad, yəni onlar Quranın xüsusi məna və izahını bilmələrini, İmam Baqir (ə)- ın uca atası İmam Zeynəlabidin (ə)- dan olan rəvayətə və ondan da əvvəl Əmirəl Möminin (ə), İmam Həsən və İmam Hüseyn (ə)- dan rəvayətlərə əsasən dəfələrlə bəyan olunmuşdur və Peyğəmbər (s) şəxsən özü təvatir hədislərdən də üstün olan hədisdə Məsum İmam (ə) –ı Quranla eyni səviyyətə göstərmişdir. Əhli sünnət kitablarında İmam Zeynəlabidin (ə)- ın xütbəsinin təfsirində belə nəql olununr ki, Əhli- Beyt (ə)-dan İmamlar səmimi seçimdir və bu böyüklərimiz .xilqətin yeganə mərcə və ilahi höccətləridir

səh:۴۴

## ŞİƏ TƏFƏKKÜRÜNÜN ELMİLİYİ.۵

:BEŞİNCİ SUAL

Cəmiyyətin idarə olunması Əmirəl Möminin (ə)- ın dövründə ۵ il müddət kimi qısa zamanda Məsum imamların ixtiyarında olmamışdır. Şiə baxışına əsasən dini hökumətin yaradılması, hansı səviyyədə cəmiyyətdə əməli şəkildə həyata keçirtmək ?imkanı mövcutdur

:CAVAB

Şiə təfəkkürü bir məntiqi təfəkkürdür ki, təlimat nöqtey- nəzərindən həyata keçirtmək .imkanı olub və vardır

İmamət məsələsində şiənin baxışı Peyğəmbər (s)- dan sonra cəmiyyətin dini və siyasi lideri o şəxs ola bilər ki, Peyğəmbər (s)- ın insanlar üçün gətirdiyi bütün Əhkam və Üsul elmində hamıdan elimli olsun. Tərəddütsüz Peyğəmbər (s)- ın dövründə bu xüsusiyyətlərə malik Əli (ə)- dan başqa heç bir şəxs yox idi. Buna görə də Peyğəmbər (s) özündən sonra onu canişin təyin etdi və sonra oniki nəfər olan Məsum İmamları .tərtiblə bütün cəmiyyət üçün bəyan etdi

Əlbəttə bu onların Peyğəmbərə qohumluqlarına görə deyildi, bəlkə bu onların mənəvi

və elmi bacarıqlarının xüsusiyyətlərinə görə idi ki, Allah təala insanların içindən Peyğəmbərin canişinliyi üçün yalnız

":onları seçdi. Necə ki, Quran Peyğəmbərlərin canişinləri barəsində belə buyurur

{إِنَّ اللّهَ اصْطَفَى آدَمَ وَنُوحاً وَآلَ إِبْرَاهِيمَ وَآلَ عِمْرَانَ عَلَى الْعَالَمِينَ}(١)

Allah təala Adəm, Nuh, İbrahim övladlarını və İmran ailəsini aləmlər içərisində" .seçilmiş (üstün) etdi

Əgər insanlar bütün işlərdə doğru yolda hərəkət etmək istəyirlərsə onların ardınca getməli və onları özlərinin ağası olaraq vacib şəkildə onlara itaət etməli olduqlarını bilməlidirlər və onların işlərinə Peyğəmbər (s)- ın işləri kimi hörmət bəsləməlidirlər. Bu halda şiə təfəkküründə bəyan ediləm Əhkam və proqramlar xəyali və realliqdan uzaq olmayacaq və onların həyata keçirtmək imkanı yaranacaqdır. Əksinə onlar əsl İslam təlimləridir ki, əgər şərait yaranarsa bütün cəmiyyətlərdə istifadə olunma .qabiliyyətinə malikdir

Əgər biz tarixin bəzi bölmələrində, bəzi kəslərin siyasəti aydınlaşdıraraq əməli şəkildə onun qarşısını alırlar, bu onların aydınlaşdırma bacarığının olmaması deməkdeyil, bəlkə bu əhkam insanın reallıqlarını nəzərə alaraq seçilmişdir. Buna görə bütün bəşəriyyət onun dalınca gedir- və şiə etiqadına görə nəhayət ona çatılacaqdır. Bu iş Allahın axırıncı höccəti olan Axiril Zaman tərəfindən həyata keçiriləcək və bütün bəşər .bir vahid nizamla idarə olunacaqdır

Buna əlavə olaraq Peyğəmbərlər (s)-ın dəvəti haqqın bəyanı, nicat və doğru yolu ,nişan verməkdir. Əgər elmlə insanlar bunu qəbul etməsələr, onlara demək lazımdır ki

{إِنَّا هَدَيْنَاهُ السَّبِيلَ إِمَّا شَاكِراً وَإِمَّا كَفُوراً}(٢)

Biz doğru yolu ona göstərdik, istər şükr edən olar- qəbul edər- istərsə də naşükür" ".olar

Buna görə Peyğəmbərin vəzifəsi İlahi Əhkamını bəyan etməkdir ki, buda əsl imamətdir. İnsanlardır ki, Peyğəmbərin və Məsum İmamların dəvətini qəbul edib və onun icrasında onlarla əlbir olamalıdır və bu işin onlar üçün aydınlaşmasına şərait .yaradacaqdır

.verən, eyni halda reallıq olmuşdur

Misal üçün Əmirəl Möminin (ə)- ın, Həzrət Müctəba və Seyyidil Şühəda (ə)- ın bütün əməlləri zəmanəsinin şərtlərin və reallıqın nəzərə alaraq öz işlərini həyata .keçirtmişlər

Məsələn Əgər İmam Həsən (ə) Müaviyyə ilə sülh etdisə o bütün şəraiti nəzərdən keçirərək ən münasib yolu seçdi. İmam Hüseyn (ə) da bilə- bilə Yezidə beyyət etməkdən imtina etdi və Kərbəlaya gedərək o bütün müsibətləri qəbul etdi və nəhayət öz məqsədinə çatdı. Bəli, əgər İmam Hüseyn (ə) başqa şəraitdə olsaydı, yəni hökumətin ələ keçirtmək şəraitinin və vasitəsinin yarandığını görsəydi, yenə də haqqı əldə etmək və Peyğəmbər (s)- ın xilafətindən özgələri uzaqlaşdırardı. Amma onun dövrü elə idi ki, bu məqsədi həyata keçirtməyin uyğun olmadığını bilirdi və buna görə elə metoda əl atdı ki, İslam dünyasını ayağa qaldırdı və İslamı canlandırdı. Doğrudur, zahirdə onlar xilafəti ələ keçirə bilmədilər, amma bütün insanların qəlblərində Müafiyyədən uzaqlaşdılar və Müaviyyənin İslam üçün planları suya düşdü və sonralar :bu iş barəsində belə dedilər

محمدی الحدوث و حسینی البقاء

O biri Məsum İmamlar da öz şəraitlərinə uyğun olaraq, öz vəzifələrinə əməl edərək .İslamı qorudular

İmam zaman (ə)- ın zühuruna inam şiənin təsəlli qaynağı və insanların müqavimət ruhu, səbr və dözümləri oldu və dinə etinasızlıq və ümidsizliyin qarşısın aldı və bu bir etiqatdır ki, şiəliyin təlim mətnlərində və mötəbər hədislərdə ona diqqət olunmuşdur və bu İmam Baqir və İmam Sadiq (ə)- ın zəmanəsində daha da diqqət mərkəzində oldu və insanların zalım hökumdarların cinayyətlərinə görə şiəliyə doğru qayıdışlar .çoxaldı

İnsanlar başa düşdülər ki, Peyğəmbərdən sonra bəzi səhabələrin İmamətin əslində dəyişikliklərin olması İslamda heç bir şeyi dəyişdirməyəcəyini güman edirdilər, amma sonra necə faciələr yaratdılar və İslamı öz yolundan çıxartdılar və xilafəti qəsb olunmasından tutmuş insanlara zülümlər edildi və şeytana qayıdışlar oldu. Bu

insanların İmamət barəsində imanlarını gücləndirdi və başa düşdülər ki, yalnız bu əqidədir ki, İslam

.proqramlarını həyata keçirdir və onu kədərli və təəssüblü şəkildə sona çatdırır

Buna görə Məsum İmamların hərəkət və rəftarları bir tərəfdən, zalım və sitəmkar xilafət qəsbkarlarının rəftarları başqa tərəfdən , şiə təfəkkürünün insanların qəlbinə daha çox nüfuz etməsinə səbəb oldu və onun ardınca Məsum İmamlara dönüş gücləndi və buradadır ki, biz görürük İmam Sadiq (ə) öz zəmanəsində hökumət başçılarının təlaşına baxmayaraq, ümumi insanlar arsında sevgi qazandı, hətta şiəni .onun adı ilə tanıyırlar

## ZƏMANƏNİN QƏSBKAR HÖKUMDARLARI MÜQABİLİNDƏ ŞİƏNİN MÖVQEYİ.۶

:ALTINCI SUAL

?Şiənin Hakimlər müqabilində mövqe tutması necə və hansı meyyarlar əsasında idi

:CAVAB

Şiənin mövqeyi həmişə İslamın qorunması və dinin qalıcılığı, zülümkar və qəsbkar hökümdarların qanunsuzluğunu sübut etmək olmuşdur və həmişə çalışmışdır ki, şəri .vilayətə əsaslanan İslam hökumətini qursun

Şiəlikdə şəriət məfhumlarının bəyan edilməsi yalnız Kitab və sünnət əsasındadır və bu :barədə Quran belə buyurur

{وَجَادِلْهُم بِالَّتِى هِىَ اَحْسَنُ}(۱)

”!Və onlarla ən yaxşı metodlarla, isbat və münazirə et “

Elə metodla dialoq və müzakirə et ki, ən yaxşısı olsun və xüsusi şəraitdə təqiyyə əsasında elə əməl et və davran ki, başqaları düzgün islam və həqiqi şəriətə doğru hidayət olsunlar və zəmanənin qəsbkar və rəhimsiz hökumdarlarının zülümlərindən və .hökümranlıqlarından xaric ola bilsinlər

,Buradan görürük ki, tarix boyu yalnız şiə olmuşdur ki

səh:۴۹

---

.Nəhl surəsi, ۱۲۵ ayə . [۱] -۱

.zalım hökumətlərə qarşı daim qiyamlar etmişdir

Şiə o kəslərin İmamətliyinə etiqadı vardır ki, Peyğəmbər (s) özü dəfələrlə bunu bəyan etmişdir və şiə həmişə mövqeyni İslam təlimləri və Peyğəmbər (s)- ın yolu əsasında qurmuşdur və lazım şəraitin yaranmaması müqabilində, Əmirəl Möminin (ə) kimi öz zəmanəsində zahirən sükut və kənara çəkilərək, bunu qiyamdan üstün tutmuşlar və .ya İmam Müctəba (ə) kimi rəftar edərək İslamı yox olma təhlükəsindən qorumuşlar

Amma Kərbəla hadisəsi və Seyyidil Şühəda (ə)- ın Yezidə beyyətdən imtina etməsi bir qiyam idi ki, tarix boyu bunun timsalında hərəkət görülməmişdir. Bu hərəkət bütün .müsəlmanlar üçün nümunə və mübarizə proqramıdır

Baxmayaraq ki, zahirdə Əbaəbdillahın qiyamı məğlub oldu, amma həqiqətdə qalib qiyam idi, ona görə ki, doğru İslamı canlandırdı və şiələrin üzlərindən naümidliyi .götürdü və fikirlərinin sabit və qüvvətlənməsinə səbəb oldu

İmamlar öz elmləri ilə bilirdilər ki, insanların qəlblərində Əhli- Beyt (ə) olan etiqad və imanı gücləndirmək lazımdır. Bu yolla onlar siyası, elmi və mədəni tərəflərdən güclənərək, bu yolla hökümdarlara qarşı çıxmaq və tərtiblə həqiqi İslam .hakimiyyətinin zəminini yaratmaq istəyirdilər

## ŞİƏLİYƏ ĞOLOVV TÖHMƏTİ.٧

:YEDDİNCİ SUAL

Bəzi yazıçılar, bir sıra ifrata varıb yollarını azmış firqələri şiə ilə eyni cərgədə hesab edirlər. Təəssüflər olsun ki, şiəni Ğolovvla (şişirtmə) ittiham edirlər və biz bilirik ki, bu bir töhmətdir ki, bizim dövrümüzdə də bu Vəhabilər tərəfindən nəşr, çap və risalə yolu ?ilə şiə maarifinə ləkə yaxırlar. Əgər mümkündürsə bu barədə bir az izah verərdiz

:CAVAB

Ğolovvlu əqaid məsələsi keçmişdən böyük sabiqəyə malikdir və bu barədə Qurani :Kərim Yəhud və Nəsranilərin timsalında belə buyurur

”!Yəhudilər dedilər: Üzeyr Allahın oğludur! Və Nəsranilər dedilər: İsa Allahın oğludur “

:Müsəlmanlar arasında da bu xəstəlik bu hədisdə bəyan edilir

لستلكن سبل من كان قبلكم حذوا النعل بالنعل والقذه بالقذه حتى لو ان احدهم دخل حجر ضب لدخلتموه(١)

Hansı yolu getmək istəyirsiniz ki, sizdən öncəkilər getmişdilər, ayaq-ayaqa və qulaq-“ qulağa, hətta əgər onlardan biri kərtənkələ dəliyinə girərsə, sizdə ora daxil olarsınız”. Bu



---

.Bəharul Ənvar, c ٢١, s ٢٥٧ . [١] -١

.fikirlərə Əmirəl Möminin (ə)- ın barəsində də rast gəlinir

Bəzi qruplar onun barəsində İlahilik və Allahlıq iddia etdilər və o Həzrəti öz şerlərində :Allah kimi mədh etdilər

انت خالق الخلايق من زعزع اركان خيبر جذما

قد رضينا به اماما و مولى وسجدنا له الها و ربنا

Yaradılanları sən yaratdın, o kəs ki, xeybər qalasının möhkəm bünövrəsini lərziyə“ gətirdi. Biz ondan razıyıq ki, öncül və ağamızdır və ona səcdə və torpağa doğru əyilirik ”.ki, o bizim Allah və pərvərdiğarımızdır

Bəziləri böyütmə və mübaliğə baxımdan bu sözləri və şerləri söyləyənlər deyirlər- .həqiqətdə biz o həzrəti özümüzə Allah hesab etmirik

:Buna əlavə olaraq o Həzrəti özündən rəvayətdə belə buyurur

هلك فى رجلان، محب غال ومبغض قال(۱)

İki qrup mənim barəmdə yanıldılar, mənə ya məhəbbətlərində ifrata vardılar ya da“ ”düşmənlik edərək məqam və yüksək rütbəmi dandılar

Hər halda tarix boyu bəzi belə qruplar var olub və vardırlar ki, öz əqaidlərində mübaliğə edərək ifrata varırlar. Bu kənara çıxmaların ən yüksəyi kimi isə Allah .məqamına gətirməkdir

Hər halda bu yodan kənara çıxmalar Əsl islam və şiə əqaidinə ziddilər.Belə əqaidlər daha çox özlərini Əhli Sünnət hesab edən Sufilərdən yaranmışdır. Bunlarda əsasən Hulul və ittihad və s kimi kələmələr gözə dəyir. Xoşbəxtlikdən şiələr içində sufilik məsələsi Məsum İmamların (ə) hidayətverici hərəkətləri nəticəsində, Əhli təsənun içərisində olduğu həddə rövnəq tapmadılar, bəlkə Məsum İmamlar (ə), onların .ardıcılları və böyük alimlər tərəfindən məhkum olunaraq, kənara atıldılar

Bəs bu işin şiəyə nisbət verilməsi töhməttən başqa bir şey deyil. Şiə əqaidi tovhid, Nübuvvət, İmamət, Ədalət və Məad və başqa məsələlərində inhirafatlı və ğolovvlu

mətləblərdən uzaqdır. Bu ona görədir ki, Məsum İmamlar (ə) iki və yarım əsr dinin qoruyucuları olmuşlar və elə əməl etmişlər ki, şirklə yoğrulmuş əqaidlər bu məzhəbə nüfuz edə bilməmişdir. Sonralar kitabların və məqalələrin çap olunması sayəsində bu



---

۱-[۱]. Nəhcül Bəlağ, sübhül Saleh, Qasirin sözləri, ş ۱۱۷.

.etiqad daha ətraflı izah olunmuşdur

Əlbəttə sonradan şiəlikdə sufi və xanqah kimi əqidələr peyda oldular və Əli (ə)-ın vilayət və hörmət adı altında ifratlı əqaidi bəyan etdilər və amma alimlərin uyğun .cavabları nəticəsində onlar daha çox müqavimət göstərə bilmədilər

Şiə məzhəbində əhəd olan Allahın cəlal və camal sifətlərinə şərik qoşulmur. Peyğəmbər (s)- ı və Məsum İmamları (ə)- ı Allahın bəndələri hesab edilir ki, hər .cəhətdən Allaha möhtacdırlar, yalnı Allahı zati olaraq Uca bilirlər

Əlbəttə Şiə ayə və rəvayətlərə uyğun olaraq bu böyük şəxsiyyətlərin sifət və fəzilətlərə və ali məqama və dərəcəyə malik olmalarını zikr edir və onları höccət, İmam, Vəli, möcüzə və kəramətlərin sahibi və əmri bilirlər. Bu sifətlərin heç birində ğolovv və şirk iyi gəlmir və bütün bunlar göstərir ki, onlar kamal və yüksək übudiyyət .mərtəbəsinə çataraq Allahın əmrləri qarşısında təslim olurlar

Nəhayət, İmamət Quran və rəvayətlərdən və Peyğəmbər (s)-ın hədislərində bəyan olunan İslamın əsaslarından biridir və tarixdə baş verən hadisələrin, məğlubiyyətlərin .və zamanın onun təkmil və formalaşmasında heç bir təsir və rolu olmamışdır

Buna əlavə olaraq İmam barəsində olan sifətlərdə heç bir ifrat yoxdur və bunların .bütünü hədislərə uyğun olaraq isbat olunmuşdur

ولا يملك لنفسه نفعا ولا ضراً(١)

"Və bacarığın ziyan və xeyri özünə yoxdur"

Hətta İmam, Peyğəmbər deyil, yəni ona əhkam və şəriət vəhy olmur- hərçənd mühəddisdir, yəni mələklər onunla danışırlar- amma onun mələklə əlaqəsi nəbi ilə vəhy mələyinin əlaqəsi kimi deyil, fərq yalnız Peyğəmbərə İlahi əhkam vəhy olunmasındadır. Çünki, bütün Üsul və Əhkamın vəhyi və risalət, Peyğəmbərin rehləti .ilə sona çatdı

İmamşünaslıqın vəzivəsi İmam olan şəxsin Allah tərəfindən Petğəmbər (s) vasitəsilə elan olunaraq İmamlığa seçiləni tanıtdırmaq və onları Peyğəmbər (s) kimi ümumi

bütün dini və dünyəvi işlərdə mütləq vilayət sahibi olduğunu və peyğəmbərlik sifətindən başqa bütün sifətləri- elm, ismət və s mali olduğlarını onlar üçün sübut etməkdir və xülasə biz hamımız Məsum İmamlar (ə)- ı bütün dini və dünyəvi işlərdə haqq olduğunu tanımalıyöğ. Maddi təfəkkür sahibləri və qeyb aləminə inanmayan şəxslər, Allaha, qeyb aləminə, peyğəmbər və İmamlara ğolovvlu sifətlər verirlər, çünki maddi insan bu sifətləri başa düşməkdə acizdir. Misal olaraq Maddi fikirli insanların nəzərində, Həzrət İbrahim, Musa və İsa (ə)- ın möminlərin inandığı möcüzələr bir növ ğolovv hesab edilir. Halbuki, burada heç bir ğolovvdan söhbət gedə bilməz. Bunların hamısı həqiqətdir ki, onların uca məqamının nişanəsidir. Ğolovv odur ki, Peyğəmbər və .İmamı Allah hesab edək və ya Allahın onlarla birləşmiş və s hesab edilsin

## MÖTƏZİLƏ İLƏ ŞİƏNİN ƏLAQƏSİ.۸

:SƏKKİZİNCİ SUAL

Üsuliddinin beş əsas yerə bölünməsinin səbəbi nədir? Bu məsələdə şiə ilə mötəzilinin ?əlaqəsinin rolu olub ya xeyr

:CAVAB

Şiə İslam və məzhəbi məsələlərdə bütün firqələrlə dialoq və mübahisələr etmişdir ki, buna şiə kitablarında işarə olunmuşdur. Amma heç bir etiqadi məsələ onların təsiri altına düşməmişdir. Deyildiyi kimi şiə təfəkkürü islamın özüdür, amma o biri firqələr .yeni yaranmışdır

Şiə əqaidi bu beş əsasla məhdudlaşmır. Əksinə çoxlu digər məsələr buraya aid olunur. Əlbəttə İslam və məzhəb əqaidini tovhid, nübuvvət və məadla və ya tovhid və nübuvvətlə xülasə etmək olar. Həmçinin İmamət, məad və başqa məsələlər Peyğəmbər (s)- ın dəvət etdiyi və onlardan xəbər verdiyi və xəbərlərə uyğun olaraq, .nübuvvətə və onun dediyi bütün xəbərlərə imana bərabər hesab edilir

الایمان بالنبوه ایمان بکل ما انبأ عنه النبی

".Nübuvvətə etiqad Peyğəmbərin xəbər verdiyləri şeylərə imana bərabərdir"

Həmçinin beş üsuliddin: tovhid, nübuvvət, məad, ədalət və imamətdir ki, hər müsəlmanın bunlara etiqadı olmalıdır, ağıl və

şər də bunu qəbul edir. Qisa şəkildə əqaidin qeyd edilməsi o səbəbdəndir ki, şiə İmamət və Ədalət məsələlərini o biri etiqad üsulları ilə eyni cərgədə hesab edir. Amma .Əhli Sünnət- Əşəri firqəsi-nin buna etiqadları yoxdur

Şiə öz əqaidini Peyğəmbər (s), Quran və Məsum İmamların rəvayətlərindən götürmüşdür və heç biri mötəzilə firqəsinin təsiri ilə olmamışdır. Çünki bu firqə .sonralar əmələ gəlmişdir

Əgər şiə və mötəzilə firqəsinin arasında bəzi oxşarlıqların olduğunu görürüksə, bunun vasitəli və ya vasitəsiz olaraq Məsum İmamlardan götürüldüyü qənaətinə gəlirik. Bu misal

“الجبر و التشبيه امويان و العدل و التوحيد علويان”

.çox məşhurdur ki, bizim iddiamızı təsdiqləyir

Buna əsasən bəzi yazıçılar ki, şiə məzhəbindən və onun keçmişindən xəbərsiz idilər və mötəzilə və əşəri məzhəbini təhqiq edirdilər, şiə alimlərinin məsələn Seyyid Murtəzanın Əşəri əqaidinə müxalif olduğlarını görüb sandılar ki, onlar .mötəzilədəndirlər

## İMAM (ə)–LARIN SEÇİLMƏSİNİN SİRRİ.٩

:DOQQUZUNCU SUAL

?Məsum İmamların İmamlıq və Vilayət məqamına seçilmələrinin sirri nədir

?Bəşər ağlı bunu dərk etməyə qadirdirmi

:CAVAB

Bu sual təkcə Məsum İmamların (ə) seçilməsinə məxsus deyil, bəlkə bu sual bütün Peyğəmbərlərin və hətta vəhy mələyi Cəbrail (ə)– ın seçilməsinə, Peyğəmbərlərin bəzilərinin bəzilərindən, bəzi qovmun bəziləirindən və insanların bəzi insan və .məxluqatdan üstünlüyünə həm aid etmək olar

Həqiqət odur ki, seçim Allahın işlərindən biridir ki, buna çoxlu ayələrdən dəlillər vardır, :o cümlədən Al–İmran surəsinin ٣٣ ayəsində belə buyurulur

{إِنَّ اللّهَ اصْطَفَى آدَمَ وَنُوحاً وَآلَ إِبْرَاهِيمَ وَآلَ عِمْرَانَ عَلـىَ الْعَالَمِينَ}(١)

Allah təala Adəm, Nuh və İbrahim övladlarını və İmran ailəsini aləmlər üzərində“.١ ”.üstün etdi

:Nəml Surəsinin ٥٩ ayəsində Allah təala belə buyurur .٢

{قُلِ الْحَمْدُ لِلَّهِ وَسَلَامٌ عَلـىَ عِبَادِهِ الَّذِينَ اصْطَفَى}(٢)

Həmd Allaha məxsusdur və onun seçilmiş bəndələrinə“



---

.Al–İmran surəsinin ٣٣ ayə . [١] –١

.Nəml Surəsinin ٥٩ ayə . [٢] –٢

"salam olsun

:Al-İmran surəsi, ۴۲ ayəsində belə buyurulur .۳

{وَإِذْ قَالَتِ الْمَلاَئِكَهُ یَا مَرْیَمُ إِنَّ اللّهَ اصْطَفَاکِ وَطَهَّرَکِ وَاصْطَفَاکِ عَلَى نِسَاء الْعَالَمِینَ}(۱)

Ey Məryəm! Allah səni seçdi və səni pak etdi və bütün dünya xanımlar üzərinə üstün"
".etdi

:Bəqərə surəsi, ۲۴۷ ayədə belə buyurulur .۴

{قَالَ إِنَّ اللّهَ اصْطَفَاهُ عَلَیْکُمْ}(۲)

"Allah sizdən ötrü onu seçdi"

:Əraf surəsi, ۱۴۴ ayəsində Allah təala belə buyurur .۵

{إِنِّی اصْطَفَیْتُکَ عَلَى النَّاسِ بِرِسَالاَتِی}(۳)

"Ya Musa! Mən öz risalətlərimlə danışmağımla insanlardan səni seçib üstün tutdum"

:Fatir surəsi, ۳۲ ayədə belə buyurulur .۶

{ثُمَّ اَوْرَثْنَا الْکِتَابَ الَّذِینَ اصْطَفَیْنَا مِنْ عِبَادِنَا}(۴)

"Sonra Kitabı bəndələrimizdən seçdiklərimizə miras verdik"

.Hətta Abbasi xəlifəsi olan Mənsur belə deyirdi: İmam Sadiq (ə) bu ayəyə nümunədir

{الَّذِینَ اصْطَفَیْنَا مِنْ عِبَادِنَا}(۵)

"Bəndələrimizdən seçdiklərimiz"

:Bəqərə surəsinin,۱۳۰ ayəsində buyurulur .۷

{وَلَقَدِ اصْطَفَیْنَاهُ فِی الدُّنْیَا}(۶)

"Biz onu bu dünyada seçdik"

:Həcc surəsi, ۷۵ ayədə buyurulur .۸

{اللَّهُ يَصْطَفِي مِنَ الْمَلَائِكَةِ رُسُلًا وَمِنَ النَّاسِ}(۷)

”Allah mələklərdən də elçilər seçər, insanlardan da“

:Sad surəsi, ۴۷ ayədə buyurulur .۹

{وَاذْكُرْ إِسْمَاعِيلَ وَالْيَسَعَ وَذَا الْكِفْلِ وَكُلٌّ مِّنْ الاَخْيَارِ}(۸)

”.Və onlar mənim yanımdan seçilmişlər və yaxşılardır“

:Məryəm surəsi, ۵۸ ayədə buyurulur .۱۰

{وَمِمَّنْ هَدَيْنَا وَاجْتَبَيْنَا}(۹)



---

.Al-İmran surəsi, ۴۲ ayə . [۱] -۱

.Bəqərə surəsi, ۲۴۷ ayə . [۲] -۲

.Əraf surəsi, ۱۴۴ ayə . [۳] -۳

.Fatir surəsi, ۳۲ ayə . [۴] -۴

.Fatir surəsi, ۳۲ ayə . [۵] -۵

.Bəqərə surəsinin,۱۳۰ ayə . [۶] -۶

.Həcc surəsi, ۷۵ ayə . [۷] -۷

.Sad surəsi, ۴۷ ayə . [۸] -۸

.Məryəm surəsi, ۵۸ ayə . [۹] -۹

".Və o kəsləri ki, hidayət etdik, onlarıda seçdik"

:Ənam surəsi, ٨٧ ayəsində belə buyurulur .١١

{وَاجْتَبَيْنَاهُمْ وَهَدَيْنَاهُمْ}(١)

".Şəxslərə üstünlük verib, seçdik və doğru yola hidayət etdik -"

:Al-İmran surəsi, ١٧٩ ayəsində Allah təala belə buyurmuşdur .١٢

{وَلَكِنَّ اللّهَ يَجْتَبِي مِن رُّسُلِهِ مَن يَشَاءُ}(٢)

"Lakin Allah öz peyğəmbərlərindən istədiyi şəxsi seçər və ona qeybdən bəzi şeylər .bildirər"

:Şura surəsi, ١٣ ayədə buyurulur .١٣

{اللَّهُ يَجْتَبِي إِلَيْهِ مَن يَشَاءُ}(٣)

".Allah kimi istəyirsə onu da seçir "

:Yusuf surəsi, ٦ ayədə buyurulur .١٤

{وَكَذَٰلِكَ يَجْتَبِيكَ رَبُّكَ}(٤)

".Pərvərdigarın səni belə seçir "

.Bunlardan başqa bir çox ayələr seçimin həkimanə iş və İlahi sünnət olduğunu ğöstərir

Imam Zeynəlabidi (ə)- ın övladı Zeyd Şəhidin "Əl Sfut" adlı risaləsində birinci əsrdə .Əhli- Beyt (ə)- ın seçilmə məsələsini təhqiq etmişdir

Təkvini (yaradılış) aləmində də mükafatlandırma məsələsi bəyan olumuşdur və onun zəruriliyini tamamilə ağıl dərk edir və bütün üzvlərin göz, baş, beyn ola bilmədiyi və meyvələrin bir-birinə oxşamadığı kimi bütün insanlar da bir- birinə oxşamır və onlar yaradılışdan, sifət və görünüş cəhəttən bir- birlərindən fərqlənirlər, bu o mənadadır ki, insanların hamısı kamil fərd ola bilməz.Yəni hamı Mühəmməd (s) ya Əli (ə) ya da .İbrahim Xəlilullah (s) və s ola bilməz

İmamət və Məmumiyyət, Məbus və Məbus İləyh məsələsi bu tərtiblədir ki, ya İlahi təqdir vasitəsi və yaradılış səbəbidir və ya birbaşa şəkildə ilahi təyin, aydınlaşma və seçimlə həyata keçir. Hər halda bütün ayələr sirr və hikmətlə doludur ki, yalnız Allah .təala özü bunu bilir



---

۱- [۱] . Ənam surəsi, ۸۷ ayə.

۲- [۲] . Al-İmran surəsi, ۱۷۹ ayə.

۳- [۳] . Şura surəsi, ۱۳ ayə.

۴- [۴] . Yusuf surəsi, ۶ ayə.

Bu məsələdə heç kəsin haqqı yoxdur ki, niyə mən başqa bir kəs və ya başqa bir şey olmadım? Desin. Ya Niyə bütün mələklər Cəbrail (ə) və bütün insanlar Mühəmməd Mustafa (s) olmayıblar? Və ya niyə bütün dağlar və daşlar qızıl olmayıb? Çünki, əgər belə olsaydı, aləmin kamilliyi naqis olardı və varlıqlar və onların hissələri arasındakı .nizam və həmahənglik aradan gedərdi

Bütün mövcudat və hissələr artasındakı nizam və həmahəngliyi Qurani- kərim Yasin :surəsinin ٣٨-۴٠ ayələrində dəqiq şəkildə belə şərh edir

{وَالشَّمْسُ تَجْرِى لِمُسْتَقَرٍّ لَّهَا ذَٰلِكَ تَقْدِيرُ الْعَزِيزِ الْعَلِيمِوَالْقَمَرَ قَدَّرْنَاهُ مَنَازِلَ حَتَّى عَادَ كَالْعُرْجُونِ الْقَدِيمِلَا الشَّمْسُ يَنبَغِى لَهَا اَن تُدْرِكَ الْقَمَرَ وَلَا اللَّيْلُ سَابِقُ النَّهَارِ وَكُلٌّ فِى فَلَكٍ يَسْبَحُون}(١)

Günəş də özü üçün müəyyən olunmuş yerdə seyr edər. Bu yenilməz qüdrət sahibi “ olan, bilən Allahın təqdiridir. Biz ay üçün də mənzillər müəyyən etdik. Nəhayət, o dönüb xurma ağacının qurumuş əyri budağı kimi olar. Nə günəş aya çatar nə də gecə ”.gündüzü ötə bilər. Hər biri bir göydə üzərlər

_.BÜTÜN ŞEYLƏR CAHANDA ÖZ YERLƏRİNDƏDİR_

_.DEMƏ NIYƏ BƏNGƏRİ NƏ AZ NƏ DƏ ÇOXDUR_

_.BÜTÜN BUNLAR HAQQ ƏDALƏT TƏQDİRİ VƏ HİKMƏTİDİR_

_.BİZ BAŞ AÇMARIQ, XİLQƏT SİRRİDİR_

Amma eyni halda İnsan ixtiyar və seçim sahibidir. Bu məsələ sirdir, yəni təqdir və seçimlər olduğca mürəkkəb məsələdir. Demək olar ki, “ Əgər bəşər milyon illər birlikdə ”.kəşf və təhqiq etsələr, yenə də bilinməyən sirrlər önlərində qalacaqdır

Ötən mövzunun xülasəsindən belə çıxır ki, xilqət aləmi, səbəblər və səbəb olanlar .aləmidir və eyni halda İnsan aləmi, ixtiyar və təklif aləmidir

Qəza və qədər İlahi hikməti bütün işlərə hakimdir. İmam və Peyğəmbərin, yaradılış cihadının və ixtiyarının və bu qəbildən olan məsələlərin səbəbinin başa düşülməsi Allahın bütün işlərinə və kainatın sirrinə dair elmi əhatəsinin olması lazımdır ki, bunu yalnız o kəslər başa düşürlər ki, Allahın

.xüsusi inayətinə nail olurlar ki, bütün Peyğəmbər və Məsum İmamlar belədirlər

Halbuki, bütün bəşər müxtəlif yollarla məsləhət olmuşdur ki, ay, günəşə və..... sahib çıxsınlar, çünki, Allah onları insanın fəthi üçün yaratmışdır. Onlar çalışaraq aləmin sirrinə əl atıb, ondan bəhrələnsinlər. Amma hansısa səbəbdən onu başa düşməsələr .bunu İlahi təqdir qəbul edib, onun varlığının bərəkətindən faydalansınlar

Buna görə də bizim vəzifəmiz Peyğəmbər və məsum İmamların təlim və bələdçiliklərindən yararlanaq və onların hidayətlərinin mövcudluğunu böyük İlahi nemət hesab edək və onları özümüzə nümunə götürək və o höccətlərin seçilməsinin və İlahi haqqın fəlsəfəsini naqis ağlımızla başa düşə bilmiriksə, onları inkar edib ona müxalif olmayaq. Əks halda o kəslərdən hesab olunacağıq ki, Peyğəmbər (s)- ın dövründə bu seçimin İlahi itrət olmasını cahillər kimi inkar etdilər və kafirlərdən :oldular. Qurani Kərim bu barədə Nisa surəsinin ۵۴ ayəsində belə buyurur

{أَمْ يَحْسُدُونَ النَّاسَ عَلَ‍ىٰ مَا آتَاهُمُ اللّهُ مِن فَضْلِهِ فَقَدْ آتَيْنَا آلَ إِبْرَاهِيمَ الْكِتَابَ وَالْحِكْمَةَ وَآتَيْنَاهُم مُّلْكاً عَظِيماً}(۱)

Yoxsa onlar Allahın öz nemətindən bəxş etdiyi şeylərə görə insanlara- Peyğəmbər və“ ailəsinə- həsəd aparırlar? Halbuki biz İbrahim övladlarına da kitab və hikmət ”.vermişdik və onlara böyük hökumət bəxş etmişdik

Bu ayənin təfsirinə əsasən bu ayə onların şəninə nazil olmuşdur. Biz təfəkkür və düşüncə yolu ilə kainatın vəziyyətini başa düşməliyik ki, hər şey öz yerində qərar verilmişdir və İlahi hikmət və elm bütün kiçik və böyük yaradılış üçün naməlumdur. :Buna görə Ənam surəsinin ۱۲۴ ayəsində belə buyurulur

{اللّهُ اَعْلَمُ حَيْثُ يَجْعَلُ رِسَالَتَهُ}(۲)

”.Allah Peyğəmbərliyi hara (kimə) göndərəcəyini özü daha yaxşı bilir“

Buna görə də Peyğəmbərlərin və İlahi varislərin seçimi Allahın digər işləri kimi xüsusi hikmətə malikdir, hərçənd

.bəşər öz naqis ağıl və elmi ilə bu sirr və mürəkkəbliyi anlamağa qadir deyildir

## ALLAH TƏBARÜK VƏ TƏALANIN ELMİ VƏ MƏSUMLARIN QEYB ELMLƏRİ.۱۰

:ONUNCU SUAL

Peyğəmbər (s) və Məsum İmamların qeyb elmlərini izah edərdiniz? və buna əsasən ki, Allah təala kamil və camal sifət və elmində şəriki olmadığını nəzərə alarsaq- Allahın elmi ilə İmamın elminin fərqini və İmamın elmi ilə Peyğəmbərin elminin fərqini bəyan ?edərdiniz

:CAVAB

Hər kəs tarix, hədis və seyr kitablarını oxuyarsa, bu işdə Peyğəmbər (s)- ın və Məsum İmamların qeyb işlərindən xəbər verdiyini və bunların əksəriyyətinin hadisədən bir az .öncə olduğunu bilər və şəkk etməzlər

Bu xəbər xüsusiylə Peyğəmbər (s) və Əmirəl- Möminin (ə) şəxsləri barəsində çoxdur .ki, onların hər biri bu ailənin möcüzələrindən hesab edilir

Hətta İbn Xəldun kimi şəxslər İmam Cəfər Sadiq (ə)- ın qeybdən xəbərlər verdiyini nəql etmişlər. Əlbəttə Allahın elmi ilə o böyük şəxsiyyətlərin elmlərinin fərqi ondadır ki, Allahın elmi onun zatıdır, amma Onların elmi qeyri- zatidir, yəni bu onlara Allah .tərəfindən verilmişdir

Allahın kamali sifətlərdə, yeganəlikdə və misilsizlikdə tayı

bərabəri və heç kəsə ehtiyacı yoxdur. Lakin peryğəmbər (s) və Məsum İmamlar (ə)- ın malik olduqları elm və sifətlər və başqa sahib olduqları şeylər Allaha möhtacdır və hər .nə varlarıdırsa hamısı Allahdandır

Amma Peyğəmbər (s)- la Məsum İmam (ə)- ın qeyb işlərindən agahlığı o cəhətdəndir ki, Peyğəmbərin elmi ilə qeyb arasında heç bir vasitə yoxdur, amma İmam halbuki, öz .elminin bir hissəsini peyğəmbərdən almışdır

Hər bir halda bu böyük şəxsiyyətlərin qeybdən xəbər verməlləri səmada günəş kimi .aydın və möhkəmdir

Qeybi xəbərlər barəsində müfəssəl şəkildə məlumat almaq istəyənlər, Məsum .İmamlar (ə)- ın seyri və tarix kitablarına müraciət etsinlər

Vilayət işığı", " Nədəbə duasının şərhi" və "Təkvini və təşrii vilayət" kitablarında bu " .barədə müxtəsər şəkildə qeyd etmişik

## MƏSUM İMAMLARIN ƏMƏLİYYATLARININ GÖZƏLLİYİ.۱۱

:ONBİRİNCİ SUAL

Nə üçün Məsum İmamların (ə) əməl, yol və metodları vəzifələrini həyata keçirərkən ?eyni olmamışdır

:CAVAB

Deyilənlərin əksinə olaraq Məsum Imam (ə)-ların əməliyyətları müxtəlif hadisələr müqabilində təqribən bir- birinə oxşar olmuşdur, çox fərqləri olmamışdır.Çünki onlar əməliyyatları təşəyyo üsul və proqramları, yəni əsl islam üsulları əsasında həyata keçirmişlər. Əgər Peyğəmbər (s) və Əmirəl Möminin (ə) bəzi işlərdə bir cür və başqa işlərdə başqa cür əməl etmişlərsə, bu İslam və Quranın əmrlərinin nəticəsi ilə .olmuşdur

.Çünki, İslamda həm əmr vardır həm də onun qaydaları

:Bu barədə Ali-İmran surəsinin ۲۸ ayəsində belə buyurulur

{إِلاَّ اَن تَتَّقُواْ مِنْهُمْ تُقَاه}(۱)

"Məgər ki, onlardan çəkinin- daha vacib hədəflər üçün təqiyyə edin"

:Nəhl surəsi ۱۰۶ ayəsində buyurulur

{إِلاَّ مَنْ اُكْرِهَ وَقَلْبُهُ مُطْمَئِنٌّ بِالإِيمَانِ}(۲)

Qəlbi İmanla sabit olduğu halda məcbur edilən şəxs"



---

.Ali-İmran surəsinin ۲۸ ayə . [۱]-۱

.Nəhl surəsi ۱۰۶ ayə . [۲]-۲

"istisna olmaqla

:Təhrim surəsinin, ۹ ayəsində əmrin qaydaları haqqında belə buyurur

{جاهِدِ الْكُفَّارَ وَالْمُنافِقِينَ وَاغْلُظْ عَلَيْهِمْ}(۱)

"!Ey Peyğəmbər! kafir və münafiqlə döyüş və onlarla sərt rəftar et"

:Əraf surəsinin, ۱۹۹ ayəsində də bu barədə buyurulmuşdur

{خُذِ الْعَفْوَ وَأْمُرْ بِالْعُرْفِ وَاَعْرِضْ عَنِ الْجَاهِلِينَ}(۲)

"Hər halda sən bağışlanma yolunu tut, yaxşı işlər görməyi əmr et və cahillərdən üz döndər"

:Fussilət surəsinin ۳۴ ayəsində buyurulur

{وَلاَ تَسْتَوِى الْحَسَنَهُ وَلاَ السَّيِّئَهُ ادْفَعْ بِالَّتِى هِىَ اَحْسَنُ}(۳)

"!Heç vaxt yaxşılıqla pislik eyni deyil, pisliyi yaxşılıqla dəf et"

Həmçinin Bəqərə surəsinin ۱۹۴ ayəsində belə buyurur

{فَمَنِ اعْتَدَى عَلَيْكُمْ فَاعْتَدُواْ عَلَيْهِ بِمِثْلِ مَا اعْتَدَى عَلَيْكُمْ}(۴)

".Sizə qarşı həddini aşanlara siz də həmin ölçüdə cavab verin"

:Zinəkarlar barəsində Nur surəsinin, ۲ ayəsində belə davranmağı əmr edir

{وَلاَ تَأْخُذْكُم بِهِمَا رَأْفَةٌ فِى دِينِ اللهِ}(۵)

"!Bu işin icrasında ürəyiniz yumşalıb İlahi Əhkamın icrasına mane olmasın"

Ümumiyyətlə Məsum İmamların dövründə şərait və vəziyyət İslam dininin üsullarını qorumaq üçün belə əməlləri tələb edirdi. Bizdə İmamların doğru yolunda daim irəliləməliyik.

١- [١] . Təhrim surəsinin, ٩ ayə.

٢- [٢] . Əraf surəsinin, ١٩٩ ayə.

٣- [٣] . Fussilət surəsinin ٣٤ ayə.

٤- [٤] . Bəqərə surəsinin ١٩٤ ayə.

٥- [٥] . Nur surəsinin, ٢ ayə.

## İMAMIN RƏHBƏRLİYİNİN TƏSİR DAİRƏSİ.۱۲

:ONİKİNCİ SUAL

İmamın rəhbərliyinin təsir dairəsinə insanların hidayəti, Əhkamın bəyanı, Quranın təfsiri və şübhələrin dəf olunması şamil olduğu kimi, siyasi işlər, cəmiyyətin nizamının qorunması, əhkamın icrası, ədalətin bərpası, əmniyyətin təmin olunması və İslam sərhəddərinin qorunması da aitdirmi? Bu iki bölmənin əlaqələrini İmamət ilə bəyan ?edin və şiənin bu məsələni hansı həddə qəbul etdiyini izah edin

:CAVAB

İşarə olunduğu kimi Rəhbərin təsir dairəsi hər iki bölməyə şamil edilir. Həqiqətdə bu iki bölmə bir-birlərindən ayrılmazdırlar. Amma bu məsələ siyasətçilərin və qəsbkar güclülərin tamah və diqqətlərində olmuş, siyasi rəhbər və insanlara hökmüranlıq .etmək olmuşdur

Buna görə də Məsum İmamlar və İmamətin əsli ilə müxalifət etmişlər və əgər dinin başqa bölmələri, yəni mədrəsə, məktəb və təhsil ocağlarının yaradılması yolu ilə siyasət meydanına daxil olsaydılar bunlara da müxalif olardılar. Bu ona görədir ki, insanlar Məsum İmamlara ehtiyacları olduqlarını az hiss etsinlər və onlardan uzaqlaşsınlar və nəticədə onların dini və mənəvi təlim və tərbiyəsinin təsiri altına .düşməsinlər

səh:۶۹

Elə buna görə də onların elmi mərkəzlərdə və ictimaiyyətdə bəyan olunmasında qorxurdular və görürdülər ki, onların elmi qüdrətləri və açıq fikirli hidayətləri vasitəsilə insanlar inkişaf edəcək və şiə təfəkkürü hakim olacaq və insanlar Əhli- Beyt (ə)- a .daha da yaxılaşacaq

Buna görə biz Peyğəmbər (s)- ın sözlərində İmamətin bütün dini, dünyəvi işlərdə hakimliyini qeyd etdiyinin görürük. Buradan belə başa düşülür ki, Peyğəmbər (s) bu tərif vasitəsi ilə bütün cəmiyyətdə və özünə canişinlikdə İmamın vilayətinin hakimiyyətinə diqqət yetirmişdir. Çünki, dini və mənəvi işlərdə hakimiyyət və rəhbərlik və Əhli- Beyt (ə)- ın elmi cəhətdən ucalığı inkar edilə bilməzdi və siyasi məsələlər ilə insanların dini və mənəvi irşad və hidayət məsələlərində əlaqə olmasaydı, vəzifə .pərəstlərin müxalifətçiliyi də olmazdı

Əgər onlar bu məsələ barəsində də müxalifətçilik etmək istəsəydilər cəmiyyət bunu .qəbul etməzdi, çünki insanlar onların elmi qüdrətlərundən xəbərdar idilər

Vilayət kələməsi daha çox hökumət, cəmiyyətin idarəsi və nizam- intizamın qorunmasında istifadə olunur. Bu barədə Allah təala Maidə surəsinin ۵۵ ayəsində belə :buyurur

{إِنَّمَا وَلِيُّكُمُ اللّهُ وَرَسُولُهُ وَالَّذِينَ آمَنُواْ الَّذِينَ يُقِيمُونَ الصَّلاَةَ وَيُؤْتُونَ الزَّكَاةَ وَهُمْ رَاكِعُونَ}(۱)

Sizin ağa və vəliniz Allah, Peyğəmbər və iman ğətirənlərdir. O kəslər ki, namaz qılır və“ ”.rüku halında zəkat verirlər

:Nisa surəsinin ۵۹ ayəsində belə buyurulur

{اَطِيعُواْ اللّهَ وَاَطِيعُواْ الرَّسُولَ وَاُوْلِى الاَمْرِ مِنكُمْ}(۲)

”!Ey iman gətirənlər Allaha, Peyğəmbərə və ixtiyar sahiblərinə itaət edin“

.Gədir Xum kimi etibarlı hədis və rəvayətlərdə bu anlamı təsdiqləyir

Mənəvi İmamət, elmi və dini rəgbərlik cəhətdən imam kələməsinə birinci dərəcədə :dəlalət edir, bu səbəbdən Ənbiya surəsinin ۷۳ ayəsində belə buyurulur

{وَجَعَلْنَاهُمْ اَئِمَّةً يَهْدُونَ بِاَمْرِنَا وَاَوْحَيْنَا إِلَيْهِمْ فِعْلَ الْخَيْرَاتِ} (۳)



---

۱- [۱] . Maidə surəsinin ۵۵ ayə.

۲- [۲] . Nisa surəsinin ۵۹ ayə.

۳- [۳] . Ənbiya surəsinin ۷۳ ayə.

Biz onları əmrimizlə doğru yola gətirən rəhbərlər (İmamlar) etdik. Biz onlara xeyirli“ ”işlər görməyi, namaz qılmağı və zəkat verməyi vəhy etdik

Bu məsələyə aid bu ayə və rəvayətlərdən əlavə çoxlu sayda, səqəleyn, səfinə və digər .İmamların rəvayət və hədisləri kimi hədis və rəvayətlər mövcutdur

Bu baxımdan Səqəleyn rəvayətində belə buyurulur: “Əhli- Beytdən öndə olmayın və onlardan qabağa keçməyin.” yəni onların ardınca gedin və əgər ayə və rəvayətlərin .məzmununa diqqət etsək görərik ki, onlar rəhbərliyin hər iki tərəflərinə dəlalət edir

Buna görə də şiələr İmamları hər iki tərəfdən, siyasi və mənəvi rəhbər hesab edirlər .və digərlərini qəsibkar bilirlər

Şiə etiqadına görə İmamın mütləq rəhbər olması bir həqiqətdir ki, bunu qəsbkar hakimlər də çox gözəl bilirdilər, məsələn Mənsurun İmam Sadiq (ə)- a belə etiqadı var idi, amma buna baxmayaraq bəzi vəziyyətlərdə, məsələn əmin olduğları halda ki, İmam qiyam etmək fikrində deyil. Buna baxmayaraq öz ehdiyyatını əldən vermirdi, həmişə o həzrəti gizli casuslar vasitəsi ilə nəzarətdə saxlayırdı və az- çox ona maneəçilik törədirdilər və sonda o Həzrətin varlığına dözə bilmədi, çünki o Həzrətin .getdiyi yolu öz hökumətinə təhlükə bilirdi və buna görə onu şəhid etdi

Harun da bu yolu izləmişdi, çünki, şiə hər iki tərəfdən, mənəvi və dünyəvi tərəflərdən İmamın rəhbərliyini qəbul edir, elə buna görə də o, Həzrət Musa Bin Cəfəri illər boyu .zindan və nəzərətdə saxladı

Başqa bir tərəfdən Məsum İmamların şiə təfəkkürünün və İslam əhkamının qorunmasında çox əhəmiyyətli işlər görmüşlər. Bu işi onların möcüzələri hesab .etməliyik və bu iş yalnız İlahinin xüsusi təlimi vasitəsilə mümkün olmuşdur

.Əmirəl Möminin (ə) və İmam Hüseyn (ə) bu xüsusi siyasəti izləmişlər

Amma İmam Hüseyn (ə) o böyük hərəkata əl atdı. Diğər Məsum İmamların hər biri elə metoda əl atdılar ki, əgər belə

etməsəydilər, məhv edici zərbələrin qarşısında qalıcı ola bilməzdi. Amma Şiə məzhəbinin qalıcı olduğunu görürük və bu gün dünyaya İslamın həqiqətlərini və .ədalətli dünyəvi hökuməti bəxş etmişdir

Bir xüsusi nöqtəni qeyd etmək lazımdır ki, bütün Məsum İmamlar mənəvi, fikr və əməli rəhbərliyin gələcəkdə mövcud olacağına vədə vermişlər. Zühur əsrində İmam Mehdi (ə) siyası rəhbərliyi ilə zalim hökumdarlar tərəfindən qəsb olunan hakimiyyətlə .birləşəcək və onun vasitəsilə bütün İslamın hədəfləri həyata keçəcəkdir

## ŞİƏ İMAMLARININ SAYI.١٣

:ON ÜÇÜNCÜ SUAL

Bildiyimiz kimi qanuni İmamiyyə məzhəbini Əsnaəşəri ona görə adlandırırlar ki, Peyğəmbər (s)- dan sonra o həzrətin canişinlərinin on iki nəfər olduğlarına inanırlar və bütün ümmətlər içərisində bu inanca sahib yeganə qrupdurlar. Sünni və şiənin nəql etdikləri Əsnaəşəri İmamlarının hədisləri və onların Peyğəmbər (s) tərəfindən deyildiyi inkar olunmazdır- müsəlmanlar içərisində yalnız bunun düzgünlüyünə əsnaəşəri şiə .məzhəbi inanır və bunun ardıcılları bu məzhəbdən hesab olunurlar

Bu deyilənlərlə bərabər bəzi hədislərdən, məsələn- "Səlim Bin Qeys"- in kitabından belə bir iddia etmək olar ki, İmamların sayı on üç nəfərdir və bu fikir həmçinin "Əbi Səhl .Hobəxti" tərəfindən də söylənmişdir

Bu deyilənlərə əsasən əgər belə rəvayətlər mövcud olarsa (yaxud da Hobəxti bu ?fikirdə olmuşdursa ki, əlbəttə güman edilmir.) bu məsələni necə izah edərdiz

:CAVAB

Biz Məsum İmamları on üç nəfər olduqlarına dəlalət edən hədisləri

"جلاء البصر لمن يتولى الائمه الاثنى عشر"

səh:٧٣

Risaləsində kifayyət qədər izah etmişik və orada aydınlaşdırmışıq ki, xarici mənasından buna dəlalət edən hədis yoxdur və əgər belə hədis mövcutdursa, vahitdir .və Üsuliddində və yəqinlik tələb olunan işlərdə bir xəbərin olunmasına etimad edilmir

Belə məsələlərdə yalnız möhkəm ağıl və ya Məsumlardan nəql olunan mütəvatir .hədislərə etimad edilir

Başqa tərəfdən çoxlu miqdarda mütəvatir və ondan da yüksək hədislərdən aydın olur ki, İmamların sayı on iki nəfərdir. Bu halda bu qədər etibarlı və qəti hədislərin müqabilində qəti olmayan bir xəbərin nə kimi etibarı ola bilərdi və bir təhqiqatçı şəxs buna necə etibar edə bilər? buna əlavə olaraq təkcə Əhməd xəbərlərində ۳۰ və bir neçə yolla Peyğəmbər Əkrəm (s)- dan nəql olunmuşdur ki, Məsum İmamların sayı on iki nəfərdir və Səhih Müslüm bu məsələni ۸ cür nəql etmişdir və həmşinin başqa Əhli .Sünnət kitablarında dəfələrlə bu mövzuya işarə olunmuşdur

Şiə kitablarında həmçinin İmamların on iki nəfər olmaları barəsində yüzlərlə rəvayət mövcutdur ki, bunların hamısı tanınmış şəxslər, səhabə, məhşur tabe olanlar və hətta on ikinci İmam, Həzrət Mehdi (ə)- ın dünyaya gəlməsindən iki əsr öncə nəql .olunmuşdur ki, bu bir növ gələcəkdən xəbər vermək hesab olunur

Bütün bunlarla bərabər deyilmişdir ki, “Səlim Bin Qeys” nəql edir, Peyğəmbər (s) Əmirəl Möminin (ə)- a buyurdu: Sən və sənin nəslindən olan on iki nəfər haqq .İmamlarıdırlar

Doğrusu budur ki, mövcud siyahıda və əsrlər boyu alimlərin əlində olduğu mötəbər xəbərlərə əsasən, bütün rəvayət və hədis kitablarında, eləcədə “Səlim Bin Qeys” kitabında bu siyahı Əmirəl Möminin (ə)- dan İmam Mehdi (ə)- a qədər şiənin qəbul .etdiyi tərtiblə İmamların adları qeyd olunmuşdur

Birinci əsrdə yazılmış bu kitab, etimadlıdır və İmamiyyə məzhəbinin haqq olması sabit edir. Bu kitab İmamların dünyaya gəlmədiyi dövrə aitdir buna görə bu kitabın .düzgünlüyü möhkəm qərinə və əlamətlərə dəlalət edir

Əgər belə fərz etsək ki, bu xəbər belədir, amma buna aid kitablardakı bu və ya başqa hədislər təfsir olunma qabiliyyətinə malikdirlər. Yəni, burada məqsəd həm İmamların sayı həm də Əli (ə)- ın nəslindən olmağıdır çünki onların on iki nəfərdən on bir nəfəri o Həzrətin övladlarıdır, buna görə bu hədis – daha güclü ehtimala görə tam şəkildə .bəyan olunmamışdır

Əsna əşərə (oniki İmamlıq) müxalif olan rəvayətləri "İbn Nədim", "Əbi Səhl Nobəxti"-yə də aid edir ki, bu doğru deyildir. Çünki Əbu Səhl Nobəxti elə bir kəs deyil ki, heç bir dəlil olmadan belə fikir söyləsin və şiənin tərcümə və rical yazılarında Nobəxti ailəsini təfərrüatı ilə təhqiq etmişlər və nəticə olaraq bildirmişlər ki, Nobəxti və başqaları belə nəzər irəli sürməmişlər və onun bütün məzhəb, əməl və əqidəsini mədh etmişlər. Belə aydın olur ki, bunlar silsilə səhvlərdir ki, kitabların tərcümıəsində meydana çıxır və .müəlliflər laqeyidsizlikdən və səhlənkarlıqdan onun üstündən keçiblər

Belə tanınmış şəxsiyyətlərdən əsaszız xəbər vermək, məlumatı az olan insanların .içərisinə yanlış məlumat daxil etməkdən başqa bir şey deyildir

Hər halda onikinci İmam (ə), Məhdəviyyət, qeybət və başqa məsələlər barəsindəİslamın başlanğıclarında bəyan olunmuşdur. İncil və Tövratda mövcud olan .ğeniş məlumatlara bu inancın sabiqəsi İslamda öncəki ainlərdə də bəyan olunmuşdur

## İMAM (ə)– IN MÜƏYYƏN EDİLMƏSİNDƏ AĞIL YA XƏBƏRİN MAHİYYƏTİ.۱۴

:ONDÖRDÜNCÜ SUAL

İmamət mövzusunda, əql və nəql hansı daha əvvəldir?  Başqa sözlə, İmamət mövzusuna aid məsələlər daha çox hansı dəlillərlə –ağıl yoxsa nəqli dəlillərlə– isbat ?olunur

:CAVAB

:Veilmiş sualdan aydın olunduğu kimi iki növ məsələ mövcutdur

Birinci növ məsələlər elə məsələlərdir ki, yalnız ağıl yolu ilə məlum olur və məntiq və ağlı dəlillər vasitəsilə isbat və qəbul edilir: Məsələn: Allahın mövcudluğunun, kamal .sifətlərinin və Nübuvvətin vacibliyinin isbatı bu qəbildəndir

Digər məsələlərdə mövcutdur ki, yalnız nəqli dəlillərlə isbat olunur, yəni bu məsələlərin isbatı üçün yalnız vəhy xəbərləri və ya Peyğəmbər və Məsum İmamlardan olan .məlumatlar vasitəsilə isbat olununr

Burada elə məsələlərdə mövcutdur ki, həm ağıl yolu ilə həm də nəqli yolla isbat olunur, .əlbəttə bu vəziyyətdə nəqli dəlillər, əqli dəlillərdən üstün tutulur

Təhqiq edən şəxs bu məsələyə diqqət etməlidir və hansı məsələni ağılla və hansı məsələni nəqllə və ya hər iki yolla isbat

səh:۷۷

olunmasını görməlidir və hər məsələnin öz xüsusi həll yolunu və metodunu seçməlidir ki, uyğun nəticəni əldə edə bilsin. Əlbəttə əgər sırf nəqli yolla isbat olunmalı məsələni .ağıl yolu ilə həll etmək istərsə təbiidir ki, nəticə ala bilməyəcəkdir

Bu halda bəzilərinin İmamət məsələsində əqli mahiyyətin, nəqli mahiyyətdən üstün .olub- olmaması sualını vermək imkanı vardır

Bu sualın cavabı olaraq onu qeyd etmək lazımdır ki, İmamətin, onun şəraiti və ya İmamın vacibliyi məsələsinin isbatı, Nübuvvət və onun şəraiti məsələsi kimi ağıl yolu ilə həyata keçir. Əlbəttə əgər İmamət məsələsi o məsələlərdən olsaydı ki, ağıl yolu ilə dərk oluna bilməsəydi və yalnız nəqli yolla isbat olunsaydı, yəni Nəbinin bələdçiliyi ilə isbat olunsaydı və yalnız İmamətin əsli nəqli dəlillərə istinad edilsəydi, Nübuvvətin əsasının gərəkliliyinin əksinə olaraq uzaq deyil, amma Nübuvvətin vaciblik məsələsinin .isbatında nəqli dəlillər istifadə olunmur

Bununla bərabər İmamətin nəqli dəlillərini, Nübuvvətin nəqli dəlilləri kimi, əqli hökmün bələdçisi hesab etmək mümkündür. İmamətın təyininin necəliyi və ismətinin şərti və bunun təyininin insanlara həvalə edilməməsi, əql əsasındadır. Nəqli dəlillər bir növ əqli .hökmün təyid edicisidir

Şübhəsiz Əşairə kimi əqli hüsn və qoba etiqadı olmayan qruplar, yalnız həmin nəqli dəlil yolunu bəhs edirlər. Peyğəmbərin təsiri və ona məxsus olanların isbatı kimi, İmamın mövcudluğunun bəzi təsir və faydası və onun üstünlükləri yalnız nəqli dəlillə isbat olununr. Xüsusi İmamət məsələsi həmçinin- xüsusi Nübuvvət kimi əvvəlki Peyğəmbərin aydınlaşması növbəti Peyğəmbərin isbat edilməsi ilə nəticələnir. Peyğəmbərin İmamətdə İmamlığının və həmçinin sabiq İmamla növbəti İmamın aydınlaşdırılması onun İmamətinə dəlildir. İmamətlikdən fərqli olaraq Nübuvvət əsasən möcüzə yolu ilə isbat olunur və bu təkcə etimadlı dəlildir. Hərçənd ki, Nəbi özündən öncəki Nəbinin vasitəsilə müəyyən və möcüzə vasitəsilə isbat edilir. Burada

İlahi sünnət də icra olunmuşdur ki, Peyğəmbərlər möcüzə vasitəsilə seçilirlər! Çünki, .Peyğəmbərlərin möcüzə vasitəsilə isbatı hamı üçün dərk olunandır

Lakin sabiq Peyğəmbərin müəyyən edilməsi yalnız o sabiq Peyğəmbərin möminlərə höccəti vasitəsilə həyata keçir. Bu o səbəbdəndir ki, möcüzə vasitəsilə isbatın bir ümumi yol olduğundan, hamı üçün höccətdir. Bununla belə, Nəbinin möcüzə göstərməsinin zaman və məkan cəhəttən mövcud olmayan bir şəxs üçün isbatı möcüzədir, əql yoluna aitdir. Əlbəttə Quranı məcid yeganə möcüzədir ki, onun isbat edilməsi üçün nəqli dəlilə ehtiyac yoxdur. Ona görə ki, o əbədidir. Çünki, Quranın özünün müəyyən edilməsi üçün Quran kimi möcüzənin gətirilməsinin mümkünsüzlüyü .bütün zamanlarda onun möcüzə olmasına dəlalət edir

İmamət məsələsində birinci İmamın təyini yalnız Peyğəmbər (s)- ın vasitəsilə müəyyən olunur və ümumi İmamət mövzusunda isbat olunmuşdur ki, İmamətliyə İmam yalnız Allah təala tərəfindən Nəbi vasitəsilə təyin edilir. İmam tərəfindən edilən möcüzələr, onun düzgün İmamət iddiasıdır və nəbi üçündə müəyyənlikdir. Əgər Peyğəmbər tərəfindən təyin və müəyyənləşdirmə olmasaydı, İmamət məsələsini .aydınlaşdırmaq üçün əqli dəlillərə istinad edilməli idi

Belə demək mümkündürsə, Peyğəmbərə vacibdir ki, Allah təala öz hikməti ilə Peyğəmbəri İmamətin təyini işinə ezam etmişdir ki, İmam özündən sonrakıları müəyyən edib, tanıtdırsın. Hərçənd ki, onun müəyyən edilməsini bizim ağlımız qəbulundan xaric olmuş ya konkret olmuşdursa ya onun dəlilinə şübhə icad olarsa, çünki Allah təala tərəfindən yalnız bir nəfər Əmirəl Möminin Əli Bin Əbitalib (ə) müəyyən edilmişdir. Bəs bir şəxs ağlı ilə Allah tərəfindən Peyğəmbər vasitəsilə təyin .olunan Həzrət Əli (ə)- dan başqa heç kəsi tanımayacaqdır

Yaxud da deyiləcəkdir ki, İmamın təyin edilmə şəraiti Allah və Peyğəmbər tərəfindən din və dünya işləri üçündür və Həzrət Əli (ə)- dan başqa Əhəd olan Haqq tərəfindən ismət iddiası edilməmişdir, demək olar ki, ağıl vasitəsilə başa düşülür ki, Əli Bin Əbi .Talib (ə) seçilmiş İmam və məsumdur

Həmçinin Onikinci İmamın İmamətliyi barəsində deyilir ki, nəql olunanlara uyğun olaraq yer üzü İmam və höccətsiz nə zahirdə nə də qeybətdə olmayacaq və İmamətin silsilə ardıcıllığı min ildən çox arası kəsilməməlidir. O Həzrətdən başqa heç bir şəxs İmamət iddiası etməmişdir, ya da etmişdisə də onun batil olması sübut edilmişdir. Bəs qeybətdə olan o Həzrətdən başqa digər şəxs İmam ola bilməz və o İmamdır. Əgər O həzrətin İmamətdiyinə digər iradlar tutularsa onda keçən bölmələrdə İmamətliyə olunan iradlar yenidən ortaya çıxacaqdır. Baxmayaraq ki, onların planlaşdırılmasının .və təyinin yeri deyil, çünki Xudavənd həkimdir və çırkin işlərdən pak və nöqsansızdır

## İMAMƏT VƏ HƏZRƏT MEHDİ (ə) IN ZÜHURUNA ETİQADIN ƏSAS MƏNBƏLƏRİ.۱۵

:ON BEŞİNCİ SUAL

Həzrət Mehdi (ə)- ın İmamətliyinin məqamı, etibarı, rəhbərliyi və zühuruna inam hansı ?İslam mənbələrindən istifadə olunmuşdur

Baş vermiş hadisələr və keçən zamanın bunun təkmilləşməsində hansı təsirləri ?olmuşdur

:CAVAB

Imamət və cəmiyyətə rəhbərliyə etiqad Islamn əsas məsələlərindən biri olub və onun təlimində yer almışdır. Quran ayəsinə uyğun olaraq İmamət təyin olunandır ki, Həzrət .İbrahim Xəlil (ə) böyük imtahanlatdan sonra ona əta ediıldi

{وَإِذِ ابْتَلَى إِبْرَاهِيمَ رَبُّهُ بِكَلِمَاتٍ فَأَتَمَّهُنَّ}(۱)

Sünni və şiənin nəql etdikləri müxtəlif rəvayətlərə görə bu seçim Peyğəmbər (s)- ın .Əhli- Beytində edilmişdir və bu böyük ilahi nemət onlar üçün ixtisaslaşmışdır

Bu əsasda müəyyən olunmuşdur ki, hər əsrdə bu ailədən bir nəfərə lazimi səlahiyyətləri həyata keçirmək üçün İmamət və rəhbərlik onların öhdəçiliyinə .verilmişdir



---

.Bəqərə surəsi, ۱۲۴ ayə . [۱] -۱

Belə şəxs Allahın höccəti, Qurana bağlı, insanlara yol göstərən və din və şəriətin qoruyucusudur. İmamətin əsli Peyğəmbər (s)- ın dövründən bu günə kimi davam etməkdədir və bizim dövrümüzdən dünyanın sonuna qədər davam edəcəkdir. Həzrət Mehdi (s)- zühur dövrünün zahiri kamal və gözəlliyi sevinc və şənlik vericidir və ədalətli vahid dünyəvi hökumətin o həzrət tərəfindən qurulması ilə bəşər istedlarının üzə çıxması, təfəkkürlərin təkmilləşməsi, yerin və göylərin bərəkətinin aydınlaşması və .dünya xeyr, ədalət və bərəkətlı olacaqdır

Yeni dünya ümməti üçün proqrqmların təşkili, ədalətli və tovhid hakimiyyətin inkişafına xidmət edəcək, yalnız İslam təlimlərindən istifadə olunacaqdır. Qurani Kərim bir neçə surədə bunu elan etmiş və yüzlərlə nəbəvi rəvayət Mehdi (ə)- ın zühurundan sonra yer üzündə İslamın dünyəvi olacağı, ədalətli hökunətin qurulacağı və kamil əmniyyət bərqərar olacağı qeyd olunmuşdur və onu risalət ailəsindən, Əli (ə) və Fatimə (ə)- ın övladı olacağı və həmdə onun ad və künyəsinin Peyğəmbər (s)- dan .olduğunu xəbər vermişdir

Həzrət Mehdi (ə)- ın zühuruna sifətləri ilə birlikdə etiqad İslamın əvvəl illərində aydın olunmuşdur. Etibarlı hədislərə uyğun olaraq Peyğəmbər (s) bu mübarək hadisəni xəbər vermiş və ümmətdən bu böyük günün intizarında olmağı istəmişdir. Baxmayaraq ki, zühur məsələsi İslamın dünyaya yayılması və haqqın batil üzərində qələbəsinin işarə olunması ilə əlaqədar başa düşülür. Amma bu o mənada deyil ki, zühur məsələsi yalnız bir məfhum kimi hədislərdən anlaşılır. Buna dəlalət edən .rəvayətlərin mətn və mənası bir başa şəkildə onu sübut edir

Bu əqidənin yaranmasında məqsəd məlum olduğdan sonra demək olar ki, bu ümumi şad xəbər və pozulmayan vədə, rəvayət əsasındadır. Peyğəmbər (s)- dan sonra baş verən hadisə və vəziyyətlər, onun yaranmasında rol oynamamışdır. Ona görə ki, bu təfəkkür risalət əsrində başlamışdır və ona aid hədislərin

sayı minə yaxındır ki, hədis və təfsir kitablarında geniş surətdə qeyd edilmişdir və əhli süünətin böyük Alimləri bu barədə kitablar çap etdirmişlər və yazılmış bu kitabların üzərindən oniki əsrdən çox zaman keçir və bu kitasblar böyük İslam alim və mütəfəkkirləri tərəfindən yazılmışdır. Səmimiliklə qeyd etmək lazımdır ki, Mehdi (ə)- ın zühurunu Peyğəmbər əkrəm (s) xəbər vermiş və bu xəbəri səhabə və onlardan sonra .gələn insanlara nəql etmişlər

## QURAN Və MəHDəVİYYəT.۱۶

:ON ALTINCI SUAL

On iki İmamların vilayəti, Həzrət Mehdi (ə)- ın ədalətli hökuməti və İslamın dünyaya ?yayılmasına Quranı Kərimdən hansı ayəni dəlil gətirmək mümkündür

:CAVAB

.On iki İmamların vilayət və İmamət məsələsinə dəlalət edən ayələr kifayyət qədərdir

:Buna misal olaraq Rəd surəsinin ۷ ayəsini nümunə göstərə bilərik

{إِنَّمَا اَنتَ مُنذِرٌ وَلِكُلِّ قَوْمٍ هَادٍ}(۱)

".Yalnız sən qorxudan və hər tayfa üçün hidayət vericisən "

:Bundan başqa Bəqərə surəsinin ۱۲۴ ayəsində belə buyurulur

{لاَ يَنَالُ عَهْدِى الظَّالِمِينَ}(۲)

Mənim əhdim zalimlərə çatmaz! – və yalnız sənin övladlarından olan o dəstə ki, pak və" ".məsumdurlar, bu məqama layiqdirlər

:Bu barədə Allah təala Yunus surəsinin ۳۵ ayəsində belə buyurur

{اَفَمَن يَهْدِى إِلَى الْحَقِّ اَحَقُّ اَن يُتَّبَعَ}(۳)



---

.Rəd surəsinin ۷ ayə . [۱] -۱

.Bəqərə surəsinin ۱۲۴ ayə . [۲] -۲

.Yunus surəsinin ۳۵ ayə . [۳] -۳

".De: Haqqa yönəldən bilən kəs, dalınca gedilməyə layiq şəxsdir“

Bu ayələr cəmiyyətin məsum rütbəyə sahib İmamsız olmaması və ən alim olmasına dəlalət edilməsində istifadə olununr və bu şiə etiqadına məxsusdur. Bu barədə Qurani :Kərim, Nisa surəsinin ٥٩- cu ayəsində belə buyurur

{اَطِيعُواْ اللّهَ وَاَطِيعُواْ الرَّسُولَ وَاُوْلِى الاَمْرِ مِنكُمْ}(١)

Ey İmam gətirənlər! Allaha, Peyğəmbərə və özündən olan ixtiyar sahiblərinə itaət“ "!edin

Bu şiə məzhəbində İmam və əmr sahibinin məsum olmasında istifadə olunur. Buna .görə bu ayədə birbaşa şəkildə insanlara əmr edilmişdir ki, əmr sahiblərinə itaət edilsin

.Peyğəmbərə itaət mütləq olduğu kimi əmr sahiblərinə də itaət mütləq edilmişdir

Əlbəttə ona mütləq şəkildə itaət olunan mömin şəxs, məsum olmalı və xəta və səhvdən uzaq olmalıdır. Məlim olduğu kimi İmamların məsumluğuna etiqad yalnız şiə .məzhəbində mövcutdur

Əlavə olaraq bu hədis və ayələrin təfsiri ona dəlalət edir ki, bu ayədə və digər ayələrdə məqsəd oniki İmamlardır və bu təfsirlərdə o böyük şəxsiyyətlərin adları da أطيعوا الله- .müəyyən olunmuşdur

Sonda İslam dinin dünyaya yayılması və onun bütün dinlər üzərində qələbəsinə Tövbə surəsinin ٣٢, ٣٣ ayələrini, Fəth surəsinin ٢٨ ayəsini və Səf surəsinin ٦ və ٨ ayələrini və s .nümunə göstərmək kifayyətdir

Bu ayələrdə Həzrət Mehdi (ə)- ın zühuru ilə haqq dininin bütün dinlər üzərində qələbəsi .və verilmiş vədələrin həyata keçməsi anlaşılır

Amma İmam Mehdi (ə)- ın zühuru barəsində təfsir olunan ayələr təqribən yüzə yaxındır və “Əl Höccətu fiyma nuzilə fil qaimul höccət“ kitabında bunlar toplanmışdır. :Buna misal olaraq aşağıdakı Nur surəsinin, ٥٥ ayəsini nümunə göstərmək olar

{وَعَدَ اللهُ الَّذِينَ آمَنُوا مِنكُمْ وَعَمِلُوا الصَّالِحَاتِ لَيَسْتَخْلِفَنَّهُم فِى الاَرْضِ كَمَا اسْتَخْلَفَ الَّذِينَ مِن قَبْلِهِمْ وَلَيُمَكِّنَنَّ لَهُمْ دِينَهُمُ الَّذِى

ارْتَضَى لَهُمْ وَلَيُبَدِّلَنَّهُم مِّن بَعْدِ خَوْفِهِمْ اَمْناً يَعْبُدُونَنِى لاَ يُشْرِكُونَ بِى شَيْئاً



---

۱- [۱] . Nisa surəsinin ۵۹- cu ayə.

وَمَن كَفَرَ بَعْدَ ذَٰلِكَ فَأُوْلَئِكَ هُمُ الْفَاسِقُونَ}(۱)

Allah aranızdan iman gətirib yaxşı işlər görənlərə- yalnız Mənə ibadət edərlər, heç “ nəyi Mənə şərik qoşmazlar, deyə – onları özlərindən əvvəlkilər kimi yer üzünün varisləri edəcəyini , onlar üçün onların Allahın bəyəndiyi dinini möhkəmləndirəcəyini və onların qorxusunu sonra əmin- əmanlıqla əvəz edəcəyini vəd buyurmuşdur. Bundan ”!sonra küfr edənlər, şübhəsiz ki, əsl fasiqlərdir

:Qəsəs surəsinin ۵ ayəsində belə buyurulur

{وَنُرِيدُ اَن نَّمُنَّ عَلَى الَّذِينَ اسْتُضْعِفُوا فِى الاَرْضِ وَنَجْعَلَهُمْ اَئِمَّةً وَنَجْعَلَهُمُ الْوَارِثِينَ}(۲)

Biz istəyirik ki, o yerdə zəif düşüb əzilənlərə mərhəmət göstərək, onları öndə“ ”.gedənlər və varislər edək

:Ənbiya surəsinin ۱۰۵ ayəsi də bu məzmundadır

{وَلَقَدْ كَتَبْنَا فِى الزَّبُورِ مِن بَعْدِ الذِّكْرِ اَنَّ الاَرْضَ يَرِثُهَا عِبَادِىَ الصَّالِحُونَ}(۳)

Biz Zəbur kitabından sonra Tövratda da yalnız saleh bəndələrimin varis – hökumət –“ ”.torpağa daxil olacağını yazmışdıq



---

.Nur surəsinin, ۵۵ ayə . [۱]-۱

.Qəsəs surəsinin ۵ ayə . [۲]-۲

.Ənbiya surəsinin ۱۰۵ ayə . [۳]-۳

## MEHDİ VƏ XİLASKARIN ZÜHURUNA VƏ MÜTƏMƏHİDLƏRİN YARANMASINA ETİQAD.۱۷

:ON YEDDİNCİ SUAL

Tarix boyu Mehdinin zühur və xilaskar olmasına inam Mütəməhhidlərin yaranmasına səbəb olmuşdur. Bəziləri bu olanların həlli üçün bu təfəkkürün kənara qoyulmasını irəli ?sürürlər. Bu baxış hansı həddə qəbul oluna bilər

:CAVAB

Bu baxış heç cür qəbul olunmur. Onda gərək bütün müsbət baxışları kənara qoyaq. Çünki onlar az və çox dərəcədə suistifadə olunmuşlar. Tarix boyu şəxslər Allahlıq iddiası, Allahın zühuru və ya Allahın özü timsalında təcəllisi iddiasını irəli sürərək etiqadın mahiyyətindən suistifadə etmişlər. Bu iş heç cür Allaha etiqad məsələsinə zərər vurmamışdır. Həmçinin çoxlu miqdarda yalançı Peyğəmbərlər meydana çıxaraq .insanları yollarından azdırdılar. Bu Nübuvvətin mahiyyətinə zərər vurmadı

Bu məsələ hər sahə və sənətdə önə çıxa bilər. Amma bu həmin sahənin mahiyyətinə .zərər yetirmir

Xülasə, yaxşı və cəzbedici mənası vardır. Əgər ad və kəlmənin əks mənası istifadə olunmuşdursa, məsələn: xainə – etibarli, zalimə – ədalətli və cahilə – bilikli deyilmişdirsə və ya tarix boyu bütün xəyanət və zülümləri xeyrxahlıq və islahat adı altında həyata keçirmişlərsə, amma bunların heç biri bu dəyərlərin və işlərin .mahiyyətinə zərər vurmamışdır

## DİNİ DÜŞÜNCƏLƏRƏ İCTİMAYİ, SİYASİ VƏ İQTİSADİ AMİLLƏRİN TƏSİRİ.۱۸

:ON SƏKKİZİNCİ SUAL

İctimai, siyasi və iqtisadi amillər Mehdinin zühurunda dini əqaid və təfəkkürlərə necə ?təsir etmişdir

:CAVAB

Ateist dünyagörüşünə görə bütün iş və hadisələr tarixi və maddi səbəblərə istinad .edilməlidir

Amma dini dünyagörüşü baxımından mahiyyəti haqq olan müxtəlif təfəkkür və əqidələr içərisində onların mənbəyi vəhy və Ənbiya dəvəti və bəşərin özünün fitri .dərkidir ki, onu ağıl, fitsrət, vəhy və nübuvvət hidayəti izah edilir

Bu baxışa görə bütün yoldan kənara çıxmalar və zərərli fikirlər maddi, tarixi və şəxsi qərəzlərin, ictimai və tərbiyə mədəniyyətinin pozğunluğunun nəticəsidir və din əqaidi .vəhy və nübuvvətdən götürülmüş əsl və həqiqidir və bəşər fitrətinin əsasıdır

Tarix, keçmiş zaman, bəşərin biliyi və ya maddi səbəb onları əmələ gətirmir. Bəlkə bu etiqadın mənşəyi ənbiyanın risaləti və Məsum İmamların İmaməti əsasında yaranmış .və əqaid bütövlükdə haqqın ağlı, insanın fitrəti və İlahi vəhydir

Buna uyğun olaraq hətta xilaskar Mehdi (ə)- ın zühuruna inamın yaranmasında heç bir ictimai, iqdisadi və siyasi

amillərin rolu olmamışdır. Bu xəbərlərin mənşəy və əmələ gəlməsi səmavi səhifələr, yol göstərmələr, xəbərlər və sözlər Həzrət Xatəmül Ənbiya (s), Həzrət Əmirəl Möminin .və sair Məsum İmamlardır

Baxmayaraq ki, Məhdəviyyətə yaxılan yalan iddialar, rütbə pərəst və siyasi qərəzlərə uyğun əmələ gəlmişdir. Bununla belə bu iddialar və zühura yalan iddiaçıların əmələ gəlməsinin əsas səbəblərinin təhlil və tanınması əsasında belə bir nəticəyə gəlmək olar ki, bu məsələ ətrafında əmələ gələn iddia və təhriflər bu məsələnin mütləq haqq .olduğunu göstərir ki, bəzi şəxslərdə bəhanə yaratmışdır

Belə ki, Allaha, vəhyə və Nübuvvətə etiqadın əsasından görünür ki, həqiqətləri qəbul etmək qabiliyyəti insanların qəlblərində mövcud olduğundan fürsətçilər bundan .suistifadə etdilər və tarix boyu Allahlıq və Peyğəmbərlik iddiaçısına çevrildilər

Mehdi (ə) məsələsində də həmçinin Peyğəmbər (s) tərəfindən bəyan olunduğuna və səhabələr tərəfindən eşidildiyinə və nəql edildiyinə görə həqiqətdir ki, hamı qəbul etmişdir. Elə buna görə də suistifadəçilərın nəzər nöqtəsində olmuşdur və şəxslər onu .müxtəlif qərəzlər üçün – bunların əksəriyyəti siyasi olmuşdur, bəhanə etmişlər

Əgər Mehdəviyyət məsələsi həqiqət olmasaydı, bu qədər ətrafda olan şəxslər belə təhriflərə əl atmazdılar. Bəs bu su istifadələr onu təsdiqləyir ki, bu məsələ həqiqət kimi .hamı tərəfindən qəbul edilmişdir

Bəzi hadisələr bəşəriyyəti həqiqətə yönəldə bilər, Həzrət İbrahim (ə)- da olduğu kimi o böyük monoteist, hadisələrdən istifadə edərək Allah pərəstliyi insanlara öyrətdi. O həzrət gecə olduğundan ulduzları gördü və dedi: Budur mənim Pərvərdigarım, amma :ulduzun batdığını görüb dedi

{لا اُحِبُّ الآفِلِينَ}(١)

".Mən batanları sevmirəm"

Həzrət İbrahim (ə) ulduzların batıb, çıxmasından istifadə

edərək insanlara təlim verirdi ki, ulduz Allah ola bilməz. Sonra ayın batıb, çıxması ilə də nəticəyə gəlirdi ki, ay da Allah ola bilməz. Daha sonra Günəş çıxır və batır və bundanda .eyni nəticə əldə edir

Bu tərtiblə bütün şirk əqaidlərə nifrət edirdi və insanları aləmin yaradıcısına doğru yönləndirirdi. Bəs hadisələr insanları həqiqətə apara bilər. Amma etiqadi həqiqətləri .hadisələrin nəticəsi kimi qəbul etmək olmaz

Düzdür, bunu demək olar ki: ötən zaman Al Əli (ə) etiqadının insanlarda güclənməsinə və onların ürəylərində şiə təfəkkürünə keçidə səbəb olmuşdur. Amma şiəlik və İmam Mehdi (ə)- ın qeybəti zamanla bəyan və təkmilləşdiyini deyən olarsa, bu düzgün deyil, .çünki, bu nəzər ötən izahlarda çoxlu sayda dəlillər vasitəsilə təkzib olundu

Heç kəs Peyğəbmər (s) tərəfindən nəql olunmuş İmamların xəbərlərinə quraşdırma deyə bilməz. Ona görə ki, onların hamısı fasiləsizliklə yanaşı, xarici oxşarlıqları da :mövcutdur ki, həqiqətdə Əmmarın şəhadəti kimi ki, Allahın Rəsulu (s) buyurmuşdur

تقتلک الفئه الباغیه(۱)

”.Səni zülümkar şəxslər öldürəcəklər“

Əmmarın Maviyə və onun qoşunu tərəfindən şəhid edilməsindən sonra heç kəs söyləyə bilməz ki, bu hədis saxtalaşdırılıb, yəni bu hədis o hadisənin nəticəsidir. Çünki, bu hadisə baş verməmişdən öncə Səhabələr bu hədisi nəql edirdilər. Buna uyğun olaraq həmçinin Məsum İmamların İmamət məsələsi üç nəfərin dilindən, yəni İmam Əli (ə), İmam Həsən (ə) və İmam Hüseyn (ə) tərəfindən nəql olunmuşdur ki, İmamların sayı oniki nəfərdir ki, onların axırıncısının adı mənimlə eynidir.(۲).(۳) Bununla belə heç kəs iddia edə bilməz ki, bu hədis uydurmadır və bu hadisənin baş verməsindən sonra .düzəldilmişdir



---

.Baharul ənvar, c ۱۸ s ۱۲۳ . [۱]-۱

.Öncəki sənəd, c ۳۶, s ۲۸۶ . [۲]-۲

## MƏNA VƏ İSTİLAHİ CƏHƏTDƏN MEHDİ.۱۹

:ON DOQQUZUNCU SUAL

Məgər Mehdi xüsusi bir ləqəb və ünvandır ki, xass sifət və xüsusiyyətlərə malik xüsusi şəxsə verilmişdir ya ümumi məfhum və ləqəbdir ki, Allah təalanın hidayət etdiyi ?kəslərə verilir. Başqa sözlə desək Mehdi və Mehdəviyyətə inam şəxsidirmi

:CAVAB

Mehdi sözü ümumi məfhumdur. Lüğəvi cəhəttən Allah təalanın hidayət etdiyi şəxslərə verilməsinə icazə verilir. Bu məfhumla bütün Peyğəmbərlər Mehdidirlər və bu məfhumun Həzrət Rəsulillah (s)- a, İmam Əli (ə) və başqa İmamlara verilməsinə icazə verilir. Ona görə ki, onların hamısı Mehdi və hidayət olunanlardır. Bu adın bu məktəbin ardıcıllarına və hidayət olunanlara verilməsinə icazə verilir. Misal olaraq, İmam Hüseyn (ə)- ın bütün Əshabı hidayət olunmuşlar olduğlarından və həmçinin bütün o kəslər ki, şiədirlər və hidayət olunmuşlar, bu adın onlara verilməsinə icazə verilir. Amma hamı bilir ki, "mehdi" kələməsi Həzrət Peyğəmbər tərəfindən hansı məqsədlə :söylənmişdir. Məsələn

المهدی من ولدی

Mehdi mənim övladlarımdandır." Ya"

المهدی من عترتی من ولد فاطمه

".Mehdi mənim Əhli- Beytimdən və Fatimənin övladlarındandır"

səh:۹۷

المهدی من ولدک Və yaxud

(Mehdi sənin övladlarındandır.”(Bəharul Ənvar, c ۳۶ və ۵۱, s ۳۰۹, ۷۸ və ۱۰۲, h ۱۴۸“

Bu bir xüsusi ad və müəyyən şəxsə aid ləqəbdir ki, o şəxs fövqəladə şəkildə əzizdir ki, Peyğəmbər (s) onun zühurunu xəbər vermişdi və Əhli- beytini bütün müsəlmanlara .öyrətmiş ki, növbə ilə o Həzrətin zühurunun intizarında olsunlar

Mehdi hidayət olunan mənasına uyğun müxtəlif hidayət mənalarında, o cümlədən yolun göstərilməsi, arzu olunana doğru və qeyri insani olan digər mənalarda istifadə .olununr və Taha surəsinin, ۵۰ ayəsində bu mənaya dəlalət edir

{قَالَ رَبُّنَا الَّذِی اَعْطَی کُلَّ شَیْءٍ خَلْقَهُ ثُمَّ هَدَی}(۱)

”.Dedi: Rəbbimiz hər şeyi öz xilqətinə verən, sonra da ona doğru yolu göstərəndir “

Bütün bunlarla bərabər bu kələmənin təhqiqindən anlaşılır ki, bu kələmə bütün hidayət olunan əksər insanlara, Allahın doğru yolu göstərməsində təsirli olanlarda istifadə .edilə bilər

:Bu xüsusda deyilməlidir

المهدی من هداه الله و قبل هدایته و اهتدای بها بعنایه منه و توفیقه

Yəni, Allahın hidayəti şamil olan kəs, Mehdidir. Başqa sözlə Mehdi yəni yolu göstərən, onun nəzərində olmaq və onun vasitəsilə İlahi inayət və tofiq nəticə vericidir ki, bunun .ən ali nümunəsi Ənbiya və Məsum İmamlardır

Mötəbər xəbərlərə uyğun olaraq “Mehdi” ləqəbi həmin vəd olunmuş Axiril Zamandır ki, onun nəsl və sifətləri hədislərdə qeyd edilmişdir. İlk dəfə bu ad o Həzrət üçün Peyğəmbər (s)- ın dövründə o Həzrət tərəfindən istifadə edilmişdir və Mehdi xilaskar .və azadlıq verici və Allah tərəfindən deyilmiş digər sözlər yalnız onun ləqəbidir

Mehdəviyyət növ kimi heç bir nəql olunan rəvayətlərdə Peyğəmbər (s) və Məsum .İmam (ə)- lar tərəfindən istifadə olmamışdır

## HƏZRƏT MEHDİ (ə) –İN ANADAN OLMASINDA TARİXİ İXTİLAFLAR.٢٠

:İYİRMİNCİ SUAL

Tarixdə Həzrət Mehdi Sahibul Zaman (ə)- ın viladətində ixtilaflar mövcutdur ki, bəziləri onun işıq ədədləri ilə ٢٥۶-cı ildə, amma bəzi rəvayətlərə uyğun olaraq hicri qəməri ilə ?٢٥٥ ci ildə anadan olduğunu bildirməkdədirlər ki, bu necə izah oluna bilər

?O həzrəti qeybəti hansı ildə baş vermişdir

:CAVAB

.Belə işlərdə olan ixtilaflar işin əsas mahiyyətinə zərər yetirmir və şübhə icad etmir

Tarixdə böyük şəxsiyyətlərin doğum tarixlərində belə ixtilaflar mövcutdur.Bəlkə də .onların çoxlarının doğum və vəfat tarixləri belə məlum deyildir

Həzrət Mehdi (ə)- ın doğum tarixində olan ixtilaf digər İmam (ə)- ların və hətta .Peyğəbmər (s)- ın viladətində olan ixtilaflardan daha azdır

Ən etibarlı mənbədən olan İmam Həsən Əsgəri (ə)- la eyni dövrdə yaşayan böyük mühəddis Fəzl Bin Nişaburinin nəql etdiyi rəvayətə görə İmam Mehdi (ə) h.q ilə ٢٥٥- ci ildə anadan olmuşdur və o bu vasitələrlə “ Mühəmməd Bin Əli Bin Həmzə

.Bin Hüseyn Bin Əbdillah Bin Abbas Bin Əli Bin Əbi Talib (ə)”-ə gedib çıxmaqdadır

:Amma Həzrət Sahibul Əmr (ə)- in Qeybəti

Həzrətin doğumundan bir müddətə qədər adi şəkildə o Həzrəti ziyarət etmək mümkün deyildi. O Həzrətin atası yalnız öz Əshab və xass şiələrə icazə verirdi ki, əziz övladı .İmam zaman (ə)- ı ziyarət etmək şərəfinə nail olsunlar

Həzrətin kiçik qeybət dövrü Atası İmam Həsən Əsgəri (ə)- ın şəhadəti gününə və Həzrətin İmamətliyinin başlanğıcına təsadüf edir, yəni hicri qəməri tarixi ilə iki yüz .altımışıncı il

Burada bir mətləbi qeyd etmək istəyirəm ki, Həzrətin qeybət məsələsi göznəlilməz deyildi, çünki müxtəlif çoxlu sayda hədislərdə o Həzrətin iki qeybət dövrü– kiçik və böyük qeybət– olacağı xəbər verilmişdi. Bu xəbər müfəssəl şəkildə Həzrətin .döğumundan öncə yazılan kitab və şiə üsulunda qeyd olunmuşdur

İMAM HƏSƏN ƏSGƏRİ (ə)– İN ŞƏHADƏTİNDƏN SONRA HƏZRƏT SAHİBUL ƏMRİN.۲۱ İMAMƏTLİYİNƏ

ŞİƏLİYİN NƏZƏRİNİN YEKDİLLİYİ

:İYİRMİ BİRİNCİ SUAL

Nobəxtinin yazdığı " Şiənin firqələri" adlı kitabına uyğun olaraq imam Həsən Əsgəri (ə)– ın şəhadətindən sonra şiələr on dörd firqəyə bölündülər, bu məlumat nə qədər ?doğrudur və bu qruplar nə vaxta qədər mövcud olmuşlar

:CAVAB

Nobəxti bu barədə " şiənin firqələri " kitabının ۹۶– cı səhifəsində belə qeyd edir: Şiə İmam Həsən Əsgəri (ə)– dan sonra on dörd qrupa və ya firqələrə bölündülər, amma təhlillərə əsasən burada mübaliğə olmuşdur. Ona görə ki, o və digər müəlliflər firqəyə aid kitablarında belə fikrə gəlmişlər ki, baxmayaraq ki, buna inanan yalnız bir nəfər olmuş, o da həmçinin sona qədər bu fikrin üzərində durmamışdır, bunlara qrup və ya firqə demək düzgün deyildir. Çünki, belə qruplartdakı insanların sayı bir neçə nəfərdən artıq olmamışdır və ya onların hansı həddə və nə qədər müddətdə öz fikirlərində .qalmğları məlum deyil. Buna görə də bunları firqə adlandırmamaq lazımdır

:Şeyx Müfid və Şeyx Tusi həmçinin bu fikirdədərlər

Şeyx Müfid " Əl Fsulil muxtare" kitabında Nobəxtinin

səh:۱۰۱

adını çəkdiyi firqələr barəsində belə qeyd edir: Mənim dövrümdə (۳۷۲ h.q) bizim .şiələrdən başqa bu adı çəkilən firqələr mövcud deyildilər

.Buna görə məlum olur ki, bu firqələrin mövcudluğu deyildiyi kimi olmamışdır

Əlbəttə bir fikir onlar barəsində irəli sürülərsə, onu bəyan edən məlum olmasa belə onu təhqiq etmək lazımdır ki, necə ki, Şeyx Müfid və Şeyx Tusi bunu təhqiq etdilər və .isbat etdilər ki, on iki şiəlikdən başqa firqələr batildir

Xülasə olaraq onu qeyd etməkdə yarar var ki, bu qrup və firqələrin qeyd edilib .sayılmasında bir növ səhlənkarlıq və mübaliğə olmuşdur

Buna görə bu qəbildən olan kitabların bu firqələr barəsində qeyd etdikləri məlumatlara .etina etməmək lazımdır

## ON İKİNCİ İMAMIN LƏQƏBLƏRİ.۲۲

:İYİRMİ İKİNCİ SUAL

İmam Mehdi (ə)- ın ləqəb və adlarının çox olması onun zati, ruhi və cismani xüsusiyyətləri ilə bağlıdır, yoxsa onun böyük islahedici işlərinin nəticəsi olaraq belə ?adlar ona verilmişdir

:CAVAB

Rəvayətlərdə o Həzrətin qeyd olunan adları bunlardır: Qaim, Mehdi, Qayib və Höccət, bunlara əlavə olaraq müxtəlif hədislərdə o Həzrətə bu rütbələr verilmişdir: .Höccətətallah, Xəlifətallah və Əlqaim və s

Dövrün ictimai və siyasi vəziyyətindən asılı olaraq insanların diqqətini bu ləqəb və adlardan bir neçəsi cəlb etmiş və ya xüsusi məsələlərdə bəyan olunmuşdur və nəticədə çıxış edənlər, yazıçılar və şairlər vəziyyətlərdən asılı olaraq bu ləqəblərdən .istifadə etmələri mümkündür

Misal olaraq qeyd etmək istəyirəm ki, Allah təalaya verilə adlar şəxsi və ya ümumi insanların vəziyyətlərindən asılı olaraq " Əlşafi" ya " Əslam"ya " Əlhafiz" ya da " Əlraziq" adları diqqət cəlb etsin. Amma bu o demək deyidir ki, Allah təalanın digər adları istifadə .olunmamalıdır və ya olunmur

Bu baxımdan İmam Zaman (ə)- ın hər bir ləqəbi o Həzrətin bir sifət və əməlinə işarə edilir və onların əksəriyyəti Həzrətin

səh:۱۰۳

.doğumundan əvvəllər hədislərdə qeyd olunmuş və bu ləqəblərlə məşhur olmuşdur

Bu cəhətdən İmam Mehdi həmin on ikinci İmam və on ikinci İmam elə həmin İmam Mehdididir, bu məsələ barəsində böyük şiə və sünni alimləri həmfikirdirlər. Əbudavud "sünən" kitabının müəllifi, on iki İmam xəbərini "Əlmehdi" kitabında qeyd etmiş və .onun Peyğəmbər ilə qohum və yaxınlığının olduğunu qeyd etmişdir

səh:۱۰۴

## QAİM LƏQƏBİ.۲۳

:İYİRMİ ÜÇÜNCÜ SUAL

Hamının bildiyi kimi İmam Mehdi (ə)- ın ləqəblərindən biri də “Qaim” ləqəbidir. Rəvayətlərdə qeyd olunduğuna görə bu ləqəbin o Həzrətə verilməsinin vacibliyi düşündürücüdür. Ona görə ki, zahirdən məlum olur ki, o həzrətin qeybətdə və həyatda olmasına dəlalət edən minlərlə rəvayətlərin əksinə o Həzrətin vəfat etdikdən sonra zühur edəcəyi anlaşılır. Xahiş edirəm əgər bu fikrə sənəd və mətn cəhətdən izah .verəsininz və fikirləşirəm ki, faydalı olacaqdır

:CAVAB

Şeyx Tusi (۱) kitabında mötəbər olmayan hədisə əsasən qeyd edir ki, İmam Mehdi (ə) vəfatından sonra zühur edəcək. Şeyx bu hədis barəzində izahlar vermişdir. Amma bu məsələyə keçməzdən öncə qısa şəkildə şiəlikdə mövcud İmaməti Ayələr, hədislər və .əqli dəlillərlə isbat etmək zərurətini hiss edirəm

۱. İmamət İlahi öhdəlikdir ki, bu öhdəliyə layiq olan şəxslər Allah tərəfindən bu müəyyən məqama təyin olunur və seçilirlər və bu İlahi seçim Peyğəmbər (s) vasitəsilə .insanlara çatdırılır

۲. İmamətin ən mühüm şərtləri onun hamıdan ismətli və ən



---

۱-[۱] . ۲۸۲ Tusinin qeybəti s.

bilikli olmasıdır ki, hamının onun bilik və doğru yolu göstərməsinə ehtiyacı olsun. Amma onun heç kəsə ehtiyacı yoxdur. Bu barədə " Xəlil Bin Əhməd" Əmirəl Möminin Əli (ə)- ın :İmamətliyi barəsində belə deyir

احتياج الكل اليه واستغناوه عن الكل دليل على أنّه اما الكل(١)

Yer üzü heç vaxt Höccət və İmamsız qalmayacaq və öz zamanının İmamını . ٣ .tanımayan halda dünyasını dəyişən kəs, cahiliyyətdə ölmüş kimi sayılır

İmamlar Peyğəmbər (s)- dan nəql olunan mötəbər rəvayətlərə əsasən on iki . ۴ .nəfərdirlər

Səqəleyn hədisinə əsasən o on iki nəfər İmamın hamısı Peyğəmbər (s)- ın Əhli- . ۵ .Beytindəndir və Quranla eyni cərgədədirlər və heç vaxt Qurandan ayrılmayacaqlar

Məsum İmam (ə)- lar Peyğəmbərlikdən başqa Peyğəmbər (s)- da mövcud dini və . ۶ hökuməti bütün xüsusiyyətlərə malikdirlər. Buna uyğun olaraq Həzrət Əli (ə) nəhcül bəlağədə belə buyurur: Onlar İnsanlara " Qəvvamullah"- dırlar və digər rəvayətə .əsasən onlar ümmətin nicat gəmisidirlər

لا يدخل الجنه الا من عرفهم وعرفوه ولا يدخل النار الا من انكرهم وهم سفن النجاه واما ن الا مه من الضلال والاختلاف(٢)

Əgər bir kəs onları tanımasa və onlar da o kəsi tanımazsa cənnətə daxil olmayacaqlar" və əgər onları inkar etməsələr atəşə daxil olmayacaqlar və onlar ümmətin yol ".azmalarından və ixtilaflardan nicat olma gəmisi və pənahgahıdırlar

İmamların ad və sifədləri tərtiblə Peyğəmbər (s) tərəfindən təyin olunmuşdur və . ٧ .bununla bərabər hər İmam özündən sonra gələn İmamı müəyyən etmişdir

Bunlar İmamətin əsasını təşkil edən etiqadlardır və qeyb aləminə, Allaha və Peyğəmbərə inamı olan hər müsəlman üçün bu həqiqətin ölçüsü ya əqli dəlillə və ya Quran dəlilləri ilə və ya mütəvatir və qəti hədis dəlilləri ilə hər üç halda isbat oluna .biləndir

Bu baxımdan İmamət bir İlahı öhdəlikdir və Allah onu özü həm əqli, həmdə sünnət yolu .ilə təyin etməyi sübut edilmişdir

Əllamə Hilli “ Əlfeyn” kitabında buna aid min dəlil qeyd etmişdir. Bu məsələnin kökü Tovhidlə əlaqəlidir, çünki Tovhid insanlara hakimiyyət və vilayət tovhidinə də şamil :olunur

له الحكم و له الامر و هو السلطان و هو الحاكم و هو الولى وهو العالم بمصالح عباده لا امر و لا نهى لأحد دونه

Əmr və fərman ondandır, o padşah, qoşun başçısı və əmr sahibidir, o ləyaqətli“ bəndələrin ehtiyaclarından xəbərdardır və kimsə üçün ondan savayı əmr və qadağa ”.yoxdur

İmamət üçün İsmət və ən bilikli olmağın dəlilləri həm əqli cəhətdən həm də Quranda .mövcutdur

:Yunus surəsinin ٣٥- ci ayəsində bu barədə belə buyurulur

{اَفَمَن يَهْدِى إِلَى الْحَقِّ اَحَقُّ اَن يُتَّبَعَ اَمَّن لاَّ يَهِدِّى إِلاَّ اَن يُهْدَى}(١)

Şəriklərinizin içərisində haqq yola yönəldə bilən bir kimsə varmı? Belə olduqda doğru“ yola yönəldən kəs arxasınca gedilməyə daha çox layıqdır, yoxsa doğru yol ”?göstərilmədikcə özü onu tapa bilməyən kəs

Mərhum Əllamə Bər ismətin vacibliyi barəsində min dəlil gətirmişdir. Bu baxımdan yer üzü höccət və İmamsız qalmayacaqdır. Buna misal olaraq Rəd surəsinin ٧- ci ayəsində :belə buyurulur

{وَلِكُلِّ قَوْمٍ هَادٍ}(٢)

”.Hər qrup üçün doğru yolu göstərənlər mövcutdur“

:Həmçinin Qəsəs surəsinin, ٥١- ci ayəsində də belə buyurulur

{وَلَقَدْ وَصَّلْنَا لَهُمُ الْقَوْلَ}(٣)

”.Biz Quran ayələrinin bir- birinin ardınca onlar üçün gətirdik“

:Bundan əlavə İsra surəsinin ٧١- ci ayəsində Allah təala belə buyurur

{يَوْمَ نَدْعُو كُلَّ اُنَاسٍ بِإِمَامِهِمْ}(۴)

"!Hər qrupu öndə gedənləri ilə çağırdığımız günü yadınıza salın"

Bunlardan başqa etibarlı xəbərlərdən bir neçəsi Kumeyl Bin Ziyadın Əmirəl Möminin (ə)- dan nəql etdiyi Nəhcül bəlağə və başqa kitablarda və həmçinin əhli sünnətin mənbələrində qeyd



---

۱- [۱] . Yunus surəsinin ۳۵- ayə.

۲- [۲] . Rəd surəsinin ۷- ayə.

۳- [۳] . Qəsəs surəsinin, ۵۱ ayə.

۴- [۴] . İsra surəsinin ۷۱ ayə.

olunmuşdur. Buradan məlum olur ki, hamı bu məsələdə həmfikirdir ki, yer üzü höccətsiz qalmayacaq. Əlbəttə höccətin zahiri şəkildə və ya qeybəttə olmasının heç bir .fərqi yoxdur

Səvaiq" və Əhli sünnətin digər kitablarında yer üzünün Əhli- Beytdən olan" .İmamlardan boş olmaması barəsində İmam Zeynəlabidin (ə)- dan nəql olunmuşdur

Bu baxışlar Məsum İmamların dualarında da bəyan olunur. Burada yalnız İmam Zeynəlabidin (ə)- ın "Səhifeye səccadiyə" kitabından ərəfə gününün duası ilə :kifayətlənirik. Həzrət burada belə buyuırur

اللهم انک ایدت دینک فی کل اوان باامام اقمته علما لعبادک، ومنارا فی بلادک، بعد أن وصلت حبله بحبلک، وجعلته الذریعه إلی رضوانک، وافترضت طاعته، وحـذرت معصـیه، وامرت بامتثال اوامره، و الانتهاء عند نهیه، و الا یتقدمه متقدم، ولا یتأخر عنه متأخر، فهو عصمه اللائذین، وکهف المومنین وعروه المتمسکین وبهاء العالمین.(۱)

Allahım! Sən öz dinini hər zaman öz İmam və öndə gedənlər vasitəsilə bəndələrin" üçün yol göstərən əlamət və şəhərlərin üçün haqq yolu nişanəsi düzəltmisən, təsdiq və kömək etmisən, Ondan sonra o İmamın dostluq əhdini öz dostluq əhdinlə birləşdirdin və onu öz sevinc səbəbinə çevirdin, əmrlərinə tabe olmağı vacib etdin və onun əmrlərinə tabe olmamağdan qorxutdun və əmrlərini icra etməyi və inkardan uzaqlaşmağı və ondan möhkəm tutmağı və ondan bir kəsin önə keçməməsi və ondan geri qalmamağı üçün əmr etdin, bəs iman əhlinin və müharibə qurbanlarının sığınacaq ".və pənah yeri və dünya insanlarının yaxşı və gözəli odur

Hər kəs duanın bu hissəsinə diqqət yetirərsə, şiənin İmamətin mahiyyəti barəsində baxışını və onun məqam və sifətlərinin onun üçün sabit olduğunu və ona heç bir şeyin .əlavə olmadığını başa düşər

Amma " O kəs ki, öz zəmanəsinin İmamını tanımadan dünyasını dəyişərsə, cahiliyyətdə olanlar kimi dünyasını dəyişmişlər." məsələsi bir həqiqətdir ki, mötəbər .hədisdlər bunu təsdiq edir. Səqəleyn və səfinə hədisləri də bu mətləbi qeyd etmişdir

İmamların on iki nəfər olması, onların hamısının

Peyəmbərin Əhli- beytindən olmasını və on bir nəfərinin Əli (ə) və Fatimə (ə)- ın nəslindən olmasını və onların birincisinin Əli (ə) sonra İmam Həsən Müctəba və İmam Hüseyn olmasını və onlardan sonra gələn doqquz nəfərin sonuncusunun İmam Mehdi .(ə) olduğunu etbarlı hədislər qeyd etmişlər

Buna görə bu məsələlərin əksinə deyilən sözlərə, nadir olan hədislər və məqbul olmayan rəvayətlərə cavab olaraq Şeyx Tusi, Şeyx Müfid və Əllamə Məclisi bu möhkəm üsul və dəlillərlə isbat edərək bu iddiaları rədd etmişlər. Çünki bu məsələni təsdiq edən hədislərin sənədləri o qədər mötəbərdir ki, hətta qeyd etmək mümkündür ki, tovhid və nübuvvət məsələsindən sonra bu iddia qədər tutarlı dəlilləri olan məsələ .yoxdur

Bununla bərabər heç bir şiə alimi o həzrətin qiyam məqamı vəfatından sonra həyata keçməsini qəbul etmir və əgər bir kəsin bu iddiada olduğunu fərz etsək bu iddia .etimadlı deyil, çünki bu iddia həqiqət və əqlə uyğun deyil

Bir neçə giriş nöqtələrdən və mətləblərdən sonra Həzrətin həyat və qeybətinin uzun olması sabit olunur və Qaim (ə)- ın vəfatdan sonra zühur edəcəyi iddiasına yer qalmır. Ona görə ki, bu iddia İmamətin mahiyyətinə və yer üzünün höccətsiz qalmasına və müxtəlif sayda İmamın həyat və qeybətinin müddətinin uzunluğuna dəlalət edən hədislərə zidd olur. Bu keçmiş iradların sənəd və rəvayətlərinə heç bit alim istinad etməmişdir. Bu hədisləri yazanlardan biri olan "Musa Bin Sədan Hənat"- ı nəql etdiyi hədisi rical elminin alimləri zəif və onun xəbərini etibarsız hesab etmişlər. O bu xəbəri Abdullah Bin Qasimdən nəql etmişdir ki, o tarixdə yalançı pəhləvan kimi tanınmışdır. O da həmçinin Əbu Səid Xorasanıdən nəql etmişdir. Amma əgər onun mövcudluğunu .tanısaq belə, onun yalançı olub- olmaması məlum deyil

İndi düşünün ki, bu qədər mötəbər hədislərin müqabilində bir yalançı ləqəbli bir pəhlivanın sözləri hansı dərəcədə etibarlıdır və onun nəzərlərinə əsasən necə fikir .söyləmək olar

:İmam Əsr (ə) üçün Qaim ləqəbinin işlədilməsi

Qaim yəni qiyam və ya üsyan edən deməkdir. Həzrət siyasi, dini və ictimai yoldan azma vəziyyətində üsyan edəcək və bütün aləmin zülmlə dolu olduğu vaxtda ona ədalət bəxş edəcək. Bu qiyam ləqəbi silahlı və ya qılıncla üsyan mənasında da istifadə .edilir

Bu baxımdan qiyamın güclü və zəif mərtəbələri vardır və bütün İmamlar ictimai, siyasi və iqtisadi vəziyyətlərdən asılı olaraq bir növ qiyam etmişlər və onlara bu ləqəbin verilməsi mümkündür. Amma Həzrət Mehdi (ə)- ın qiyamı dünyəvi qiyam olduğundan və Allahın Peyğəmbərlər vasitəsilə insanlara çatdırdığları vədə həyata keçəcəyinə görə bu ləqəb mütləq surətdə o Həzrət üçün istifadə olunur. Əgər hər hansı yerdə .Qaim ləqəbi işlədilərsə, burada məqsəd İmam Mehdi (ə)- dır

Şeyx Səduq (ə)- ın Həzrət İmam Mühəmməd Təqi (ə)- dan nəql etdiyi "Kəmal Din" kitabında buyurulur ki, " Məndən sonra İmam oğlum Həzrət Əli Nəqi (ə)- dır ki, onun əmri mənim əmrim, onun sözü mənim sözümdür və onun ardınca getmək mənim artımca getməkdir və ondan sonra İmam, onun oğlu Həzrət İmam Həsən Əsgəri (ə)- dır və onun əmri atasının əmri, onun dedikləri atasının sözləri və ona itaət atasına ".itaətdir

.Ravi nəql edir ki, sonra Həzrət sakit oturdu

Mən dedim: Ey! Rəsulillahın övladı, bəs İmam Həsən Əsgəri (ə)- dan sonra İmam kimdir? Həzrət əvvəl çox ağladı və sonra buyurdu: Həzrət Həsəndən sonra oğlu " Əl .Qaim bil Həqqil Müntəzir"- dir

?Dedim: Ey! Peyğəmbərin oğlu, nə üçün o Həzrətə Qaim adı verilmişdir

Həzrət buyurdu: Ona görə ki, onun adı yadlardan silinəcəyi və onun İmamətinə .inanların əksəriyyəti inanclarından geri döndükləri zaman o qiyam edəcək

?Soruşdum: niyə bəs müntəzir adlandırılmışdır

Buyurdu: Çünki onun qeybət dövrü uzun- uzadı olacaq, elə olacaq ki, onun giriş və çıxışını möminlər intizar çəkəcəklər, amma şək əhli onu inkar edəcək və ona istehza edəcəklər. Burada tələsənlər həlak olacaqlar, amma təslim olan

(müsəlmanlar nicat tapacaqlar.(1)

Əllamə Məclisi buyurdu: Bu zəif rəvayətdə ölmək dedikdə, o Həzrətin adı yadlardan silindikdən sonra qiyam edəcəyi nəzərdə tutulur.

Şeyx Müfid bir rəvayətdə Həzrət Sadiq (ə)- dan belə nəql edir: " Qiyam ona görə (adlandırmışlar ki, onun qiyamı haqq olacaq.(2)

Bəzi xəbərlərə görə bu ləqəb Həzrətə Allah tərəfindən verilmişdir, çünki, bu zaman o həzrət qiyam edərək namaz qılacaq.

" Əl- Mehdi" ləqəbinin verilməsinə dair münasib səbəblər göstərilmişdir və əlbəttə bu " Əl- Qaim" ləqəbinin əsas " Əl- Mehdi" ləqəbinin ikinci dərəcəli olması demək deyidir. Hər iki ləqəbin verilməsində ayrı- ayrı səbəblər mövcutdur. Mehdi ləqəbi o kəsə verilir ki, Allah təala onu hidayət etmişdir. Rütbəyə uyğun olaraq hər kəs qaim olarsa Allah onu hidayət etmiş olmalıdır. Yəni Qaim həmişə Allahın hidayət etdiyi şəxs olmalıdır, amma Allahın hidayət etdiyi şəxs lazım deyil ki, həmişə Qaim olsun. Amma Mehdi (ə) tərəfindən həyata keçirilən islahat, hərəkat, qiyam və dünyəvi hökumətin təşkili onun Qaim ləqəbini kəsb etməsinə səbəb olurğmuşdur.

Bu ləqəblər əsas və ikinci dərəcəli olmaqla iki yerə bölünmürlər. Bunların hamısı Peyğəmbər (s) və Məsum İmamların dilindən eşidilmişdir və köhnə və təzəsi yoxdur və hər biriinin öz xüsusi mənası vardır və hər biri müəyyən cəhətdən işlədilmişdir. Bəzi vaxtlarda bu ləqəblər birlikdə və yaxud da bir ləqəb o birisindən öndə qeyd olunur.

Hər halda bu ləqəblər zati və feli sifətlərə uyğun olaraq verilmişdir ki, həzrət bütün bunlara sahibdir.



---

1- [1] . " məanil əxbar kitabında da bu hədis mövcutdur, Kəmaləddin,c 2, s 378, b 36, h 3.

2- [2] . Şeyx Müfidin Ərşadı, s 364, fi Sirəteh (ə) fəsli.

## QEYBƏTİN İKİ NÖVÜ.۲۴

:İYİRMİ DÖRDÜNCÜ SUAL

Rəvayətlərin məzmunundan anlaşılır ki, Həzrət Sahibul Əmr (ə)- ın qeybət dövrü iki surətdə həyata keçmişdir. Birinci qeybətdə naib və vəkillər vasitəsilə o Həzrətlə əlaqə saxlanılması mümkün idi. Amma ikinci dövrənin başlanması ilə vəkil və xüsusi naiblərin .işi də başa çatdı

Sualım budur ki, iki qeybətin soğra və kobra termini əvvəldən qoyulmuşdur, yoxsa ?sonrakı səfəvi dövründə bu terminlər geniş istifadə edilməyə başlandı

:CAVAB

Mühüm mətləblərdə belə xırda məsələlər əhəmiyyət kəsb etmir. Çünki, birinci qeybət dövrünü qısa və ya soğra və yaxut da kiçik dövr adlandırması və ikinci dövrün böyük, kobra və yaxut da uzun dövr adlandırılması bu işin mahiyyətini dəyişdirmir. Hər halda .bu iki qeybət həyata keçmişdir

Bu məsələnin əhəmiyyətli olması bu qeybət dövrlərinin baş verməsindən öncələr hədis və rəvayətlərdə qeyd edilməsi və o qeybət dövrlərində yaşayanların bunu söyləmələləridir ki, bu iki qeybət dövrünün baş verməsinə dəlildir. Həmçinin mötəbər hədislərin mövcudluğu heç bir kəsin bu soğra və kobra qeybət dövrlərinin sonradan və ya Səfəvilər dövründə

.yaranması iddiasını irəli sürməyə imkan yaratmır

Soğra qeybət dövründə şiənin mövqiyyətinin həssas olmasına baxmayaraq heç kəs Məsum İmamlardan nəql olunan bu qədər hədislərin müqabilində bu qeybətin .sonradan saxta şəkildə düzəldilməsini iddia edə bilməz

Buradan biz görürük ki, müxtəlif şəhər və nöqtələrdə yaşayan şiələr Naiblərə müraciət edirdilər, onlar bu işi heç bir dəlil olmadan etmirdilər, mütləq hər hansı dəlil və amil var idi ki, bu da onu göstərirdi ki, onlar İmamla əlaqədədirlər, yoxsa mümkün deyil ki, Əli Bin Babəviyə kimi elm və fikr sahibləri Naiblər vasitəsilə İmamla əlaqə saxlasınlar, halbuki, onların əlaqəsi onun üçün gün kimi aydın idi. Bu hadisə onu göstərir ki, .Naiblərin haqq olması barəsində onların əllərində aşkar dəlillər olmuşdur

Digər məsələ budur ki, əlbəttə müxtəlif məntəqələrdə xüsusilə Qumda şiələrin birliyi Əbu Cəfər, Osman Bin Səid və digər Naib və vəkillər vasitəsilə həyata keçirilirdi, amma bu birliyin səbəbi on ikinci İmama olan etiqad idi. Bu məsələ Səfirlərin nüfuzunun artmasına səbəb olmuşdu, nə ki, İmamət məsələsi nəzərə alınmadan şiənin birliyi əldə .edilmiş olsun

On ikinci İmama şiələrin etiqadı onlar arasında ittifaq və birliyin yaranmasına səbəb .olmuşdu

Necə ki, bu gün İmamətə etiqad möminlərin qəlblərində alim və fəqihlərə inam və .onların İmamın ümumi naibləri kimi mənəvi nüfuzuna səbəb olmuşdur

Soğra qeybət dövründə Naiblərin təyini birbaşa şəkildə İmam (ə) tərəfindən həyata .keçirilirdi və böyük alimlərin bu naiblər qarşısında təslim olduğlarını görürük

.Bunun səbəbi İmamın bu Naibləri təyin etməsi və onların buna layiq olmaları idi

Bütün bu alim və siyasətçilərin bu Naiblər qarşısında təslim olmağı onu göstərir ki, .burada rəhbər yalnız İmam (ə) şəxsən özü olmuşdur

Şahid və qane edici dəlillərdən məlumdur ki, şiənin rical

elminin “ Əbu Səhl Nobəxti”, “ İbn Mətil” və “ Həsən Bin Cinan Səybi” kimi və digər şiənin böyük şəxsiyyətləri Naiblərin haqq olmasına etiqadları var idi. Buna görə axırıncı Naib olan Əli Bin Mühəmməd Əlsəmərinin ölümündənm sonra Naib məsələsi də sona çatdı və hamı bunu qəbul etdi və əgər kimsə Naiblik iddiası edirdisə, bu əsasa uyğun olaraq onu təkzib edirdilər. Soğra qeybət dövrünün hikmətlərindən biri də şiələri qeybət məsələsi ilə tanış etmək və kubra dövrünə şərait yaratmaq olmuşdur ki, şiə İmam (ə)- ın uzun- uzadı qeybət dövründə öz həyatlarına davam etsinlər və bu böyük .imtahandan müvəffəqiyyətlə keçə bilsinlər

